ملا نصرالدین

№2 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 2




Litoq. S.Bıxova

– A bәy, bu gün burada müsәlman teatrı var, biz dә gedәk.
– Бекъ! Идемъ въ театръ.
– A kişi, sәn Allah, әl çәk, yaraşarmı bizә müsәlman teatrına getmәk.
– Э, не интересно: сегодня мусульманский спектакль.

## ƏDƏBİYYAT

Kim nə deyər bizdə olan qeyrətə?!
Qeyrətimiz bəlli bütün millətə...

---

Biz qoca qafqazlı igid ərlərik,
Cümlə hünərməndlərik, nərlərik,
İş görəcək yerdə söz əzbərlərik.
Aşiqik ancaq quru, boş söhbətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Çırmanırıq keçməyə çay gəlməmiş,
Başlayırıq qızmağa yay gəlməmiş,
Söz verərik indi, bir ay gəlməmiş.
Asta qaçıb dürtünərik xəlvətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Cümlə cahan yatsa da, biz yatmarıq,
Qeyrəti-milliyyəmizi atmarıq,
Əhlimizi başqalara satmarıq
Bir quruşa, bir pula, ya bir çetə.
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Bizdə görünməz nə fəsadü nifaq,
İşləmədə bir-birimizdən qoçaq,
Bax, budur islamı gətirdik qabaq.
Böyləcə xidmət olunur millətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Bir işə min himmətimiz var bizim,
Bax, neçə cəmiyyətimiz var bizim,
Bunda gözəl niyyətimiz var bizim.
Ay bərəkallah bu gözəl niyyətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Hansı məkatib ki, onu açmadıq?
Hansı sənaye ki, para saçmadıq?
Verdiyimiz sözdən uzaq qaçmadıq!
İşlərimiz mindi bütün surətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Bax, neçə darüləcəzə, dari-elm,
Bir neçə məktəb, neçə asari-elm,
Bizlərik, əlbəttə, xiridari-elm!
Çatmışıq ondandı belə hörmətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Bizdə nə fəhlə tapılar, nə gəda,
Bizdə nə sail və nə bir binəva.
Bəxtəvər övladımıza, mərhəba!
Baş aparıb hər biri bir sənətə,
Kim nə deyər bizdə olan qeyrətə?!

---

Etmişik ifa atalıq mehrini,
Çəkmişik övladımızın fikrini,
Ömrümüz olsa görərik bəhrini.
Onda ki, onlar uyacaq sirqətə,
Həpsi də məşğul olacaq işrətə.
Fəxr edərik biz də bütün millətə,
Kim nə deyər bizdə olan qeyrətə?!
Ay bərəkallah bu gözəl niyyətə!

*Ağlar Güləyən*







---

## ELAN

Bu ilin əvvəlindən meydani-intişara qoyulan «Məhərrəmlik» adındakı jurnalımıza abunə qəbul olunur. Jurnalımızın məsləki avam müsəlmanları məscidə cəm edib pullarını əllərindən almaqdır. Jurnalımızda ərş, kürsü, gav, mahi, bərüləlləm və qeyri mövhumi yerlərdən və işlərdən məlumat verəcəyik. Böyük şəhərlərdə xüsusi müxbirimiz var. Mühərrirlərimiz İran və Qafqazın müqtədir mərsiyəxanlarındandır. Məhərrəm ayının onunacan müştəri olanlara iki yüz səhifədən ibarət bir dua kitabı məccani göndəriləcəkdir.

Sahibi-imtiyaz və naşiri: Fəxrülvaizin.
Baş mühərrir: Çakər Naxçıvani.
Adres: Naxçıvan, Məscidi-came.

## ƏRƏB HÜRUFATI

Osmanlı ədiblərindən Cəlal Nuri əfəndi «Yeni türk» qəzetəsi ilə nəşr etdiyi məqalədə ərəb hürufatı əvəzinə latın hürufatının işlənməsini təklif və tövsiyə edir, («Həqiqət», nömrə 3).

**Molla Nəsrəddin**

Nuri əfəndi oxşayır bir təbibə ki, əlində dava şişəsi durub xəstənin başının üstündə və deyir:

– İç bu dərmanı, yoxsa öləcəksən.

Nuri əfəndi kimi indiyədək bir neçələri müsəlman maarifinin can verdiyini görüb istəyiblər latın hürufatı ilə xəstənin bədəninə dirilik mayəsi daxil edələr. Amma qəza öz bildiyini edir və əcəl tamam olanda dəxi heç müalicə nəticə bağışlamır.

## NİŞANLI BİR QIZ

Müzlim gecədə nişanlı bir qız
Bir hüznü ələm içində yalqız.
Yatmaz, uyumaz o qəmli düxtər,
Zanularını qucub mükəddər,
Barmaqda nişan üzüklə iştə
Oynar, edər ah ol firiştə,
Fəryadla qəmli-qəmli ağlar,
Hər naləsi kainatı dağlar.

Nişanlı qız ağlaya-ağlaya deyir ki, «ey mənim qara bəxtim, nə olardı ki, mən olaydım Firəngistan şəhərlərinin birində, atamın adı olaydı Fridrix, anamın adı olaydı Avqustina, mənim adım olaydı Mariya. Nə olardı ki, dünyanı işıqlandıran günün üzünə hərdənbir baxmış olaydım və atam-anam məni qoca kişiyə vermək istəyəndə bir söz danışmağa ixtiyarım olaydı. Ey mənim qara bəxtim, nə olardı ki, milyonlarca yazılan kitablardan ikicəciyin oxumuş olaydım və biləydim ki, dünyaya nədən ötrü gəlmişik. Ey mənim qara bəxtim, doğrudur, firəng qızı olsa idim, öləndən sora yerim cəhənnəmin dib bucağı olacaq idi, amma çifayda ki, indi də öləndən sora cənnətə gedib görəcəyəm ki, elə hayana istəyirəm gedəm, hayanda istəyirəm oturam, hər yan və hər tərəf doludur keçəl-küçəl məşədi və kərbəlayılar ilə, bitli hacılar ilə və çirkli və tərli çadralı arvadlar ilə.

Ey mənim qara bəxtim!»

*Lağlağı*

## ELAN

Hər cürə xəlvət kəbinlər, siğələr edirəm, hətta xəlvət işlərin üstü açılan zaman imanımı satıb yalandan «siğə oxumuşam» deyirəm. Məsələn bizim dəndansazın əhvalatı kimi, çox ucuz qiymətə, yarmarka vaxtı, yəni orucluqda və məhərrəmdə siğeyi-zahiri, siğeyi-batini, qeyri vaxt isə 3 manat bir cüt corab, 5 manat bir kəllə qəndə.

*Adres: Şişə, Müavini-qazi*

## NƏZM

Molla, bilmirəm sənə
Namə yazım, yazmayım.
Alım bilmirəm ələ
Xamə. Yazım, yazmayım.
Niyyətin xalis eylə
Qəsd edəndə hər işə,
Təziyə saxla ona
Kamə. Yazım, yazmayım.

Gəldi mahi-məhərrəm,
Cümlə şiə xasü am
Düşübdülər bu fikrə,
Səğir, kəbir tamam
Saxlıyalar matəmin
Padşahi-təşnəkam.
Əksəri zakaz verib
Camə. Yazım, yazmayım.

Təkyə və məscidlərin
Alındı illik tozu.
Silsiləcünbanları
Sərəncam edir özü.
Dost-düşmən ayrılır
Belə məqamda düzü.
Xəlvətcə yetirdilər
Naçalnikə bu sözü.
Kim vurdu bu rəxnəni
Dinə. Yazım, yazmayım?

Dəmirçi dükanları
Təzədən düşüb işə.
Ancaq zəncir qayırmaq
Onlara olub peşə,
Bu sözümdən dəxi sən
Düşmə fikrə, təşvişə.

Naçalnik çağıtdırıb
Bir neçə alimnüma,
«Hökm edirəm mən sizə,
Bir kəs etməsin xəta.

Tapşırın siz hamıya,
Təziyə edin bərpa.
Yarmasın bir kəs başın
Hər kimsə qulaq asa,
Yetə, əlbəttə, hökmüm».
Amə. Yazım, yazmayım.

Cavabında mollalar
Deyiblər naçalnikə:
Yoxdu bizdə o qüdrət
Bu əmri bitirməyə
Camaat amadədir
Bu yolda can verməyə.
Gərək Bakı bənzəyə
Şamə. Yazım, yazmayım.

Bu mətləbdə mötəbər
Doğru rəvayət budur.
Hakimin xidmətinə
Neçə kəs edib hüzur,
Deyiblər gər eyləsə,
Bu hökm sizdən südur,
Köhnə yumurta hamı
Xəlqdə baqi durur.
Bildirdən hər kəs yığıb
Camə. Yazım, yazmayım.

Bir mətləbi kəşf edən
İki-üç alim olub,
Din, millət fikri edən,
İmanı salim olub.
Eşitgilən bu sözü,
Ələ əmmamə alıb,
Deyib vaşəriəta,
Qəlblərə od salıb,
Bu da bu cür yetişib
Kamə. Yazım, yazmayım.

Səlah adıyla durub,
Ortaya salıb fəsad.
Bəlkə edə onlara
Xəlq yaxşı etiqad.
Şeytənət peşə edib,
Adın qoyub ictihad.
Aləmə fitnə salıb
Alimi-paketiqad,
Ta sala məxluqi bir
Damə. Yazım, yazmayım.

**BƏDƏTTƏHRİR:**
Eşşəkqulaq, qabanbaş,
Heç görmüsən yeriyə daş?!

*Hərcayı*

## SÖHBƏT
### (Zakaspidə)

– Hacı, yetim uşaqların mənfəətinə siz də bir şey verin!

Hacı (cavab verir): – Qadan alım, maya qajni qod tiri rubli arabatay, adin urubel molla, adin urubel mərsiyəxan, adin urubel şkol. Bolşe şaltay-baltay yox, arabatay...

## TƏSƏLLİ

Aşqabadda uzunsaqqal bir möhtərəm ağa uşağı ölən analara təsəlli verib deyirmiş ki, bu zəmanənin uşaqlarının qalmağından isə ölməkləri çox məsləhətdir.

Kəramətə qurban, kəramətə!

## ELAN

Hamı mömin qardaşlara məlum edirik ki, Şişədə bir şəbeh fabrikası bina etmişik. Orada cürbəcür şəbeh olmaq üçün çox gözəl və qəşəng uşaqlar hazırlanıbdır. Və bu fabrikada uşaqlardan savayı əmmaməli və papaqlı kişilər də vardır. Bunlar Haris, Şümr, xüsusən Əzrəqi-Şami şəbihi olmaqda çox mahir və təcrübəli adamlardır və hər bir şəhərdə və kənddə nə cür şəbihə lazım olsa, fabrikaya xəbər versinlər ki, tezlik ilə göndərək və neçə gün bundan qabaq bir nəfər əmmaməlini də Aşqabada göndərdik ki, orada Əzrəqi-Şami şəbihi olub cibişdanı doldursun. Haydı qardaşlar, din əldən getdi. Baxmayın bir para ləməzhəb adamların sözlərinə. Bizim dinimizin rövnəqi, şövkəti, qüvvəti şəbih gətirmək və ağköynək olmaqladır. Bunlar olmasa qətiyyən din əldən gedər. Bunlar olmasa, yəqinən ki, sair millətlər bizdən qorxmazlar. Bunlar olmasa əlbəttə ki, tərəqqi etməyib cəmi millətlərdən geri qalarıq.

*Əzrəq*

## XEYİR-BƏRƏKƏT

Evimiz yıxıldı, millət əldən getdi, müsəlmançılıq lap batdı. A kişi, müsəlmanlıqdan bir nişanə qalmışdı, o da əlimizdən çıxır:

Bakı qradonaçalniki belə buyurur ki, məhərrəm ayında dəstələr küçələrdə gəzməsinlər. Küçəbəküçə «şah Hüseyn», «vay Hüseyn» deyə-deyə gəzməsinlər. Belə də müsibət olar? Allah bu oxucuların evini yıxsın, elə oturub-durub yazdılar, çığırdılar ki, şəriətdə küçələri gəzmək yoxdu. Allah evinizi yıxsın, ay belə millətpərəstlər. Bunlara qalsa, lap islam milləti əldən çıxacaq. Qoyun, qoyun balaca uşaqları uşqollaya, oxuyub, hər şeyi öyrənib deyəcəklər: nəinki küçəbəküçə dəstələr gəzməsinlər, bəlkə ağzım-dilim qurusun, deyəcəklər baş çapmaq da şəriətdə yoxdur. Pəs, bundan görünür ki, ata-babalarımız axmaq olublar və Allah onlara rəhmət eləsin, elə xeyir-bərəkət onlarnan getdi.

*Dərdmənd*

## KEÇƏN İL

1909-cu il çox qəribə il imiş, vaqeən bu ilin müddətində böyük-böyük işlər baş verib.

Qoy mən bir-bir sayım, sən də qulağını as:

1) Şuşada və Aşqabadda boğaz ağrısı uşaqlara çox əziyyət eləyib və seyidlərimizin duasının bərəkətindən hədsiz balaca uşaqlar quş olub qanadlanıb cənnətə pərvaz ediblər.

2) Keçən ilin ərzində çox adam vəfat edib. Al-

lah hamısına rəhmət eləsin, ələlxüsus Tiflis və Aşqabad və qeyri yerlərdə cəmiyyəti-xeyriyyə üzvlərinin üzvlük borclarına da Allah rəhmət eləsin.

3) Keçən il Xivə şəhərindən Səmərqəndə «Təkə» qardaşları dörd milyon dua gətirib möminlərə satıblar və genə Səmərqənddə iranlıların mədrəsəsinin nizamnaməsi itib və biçarə müəllim bilmir ki, neçə şagird qəbul eləsin. Və yenə haman Səmərqənddə müslimin qiraətxanasının qapısı gündə on yeddi saat bağlı qalır.

4) Keçən il Zaqatal okruqunun hər kəndində iki şeyx və otuz sufi peyda olub, Car şəhərində otuz qumarxana təsis olunub və Əliabad kəndində bir müsəlman məktəbi bağlanıb və mahal qazilərinin himmətlərilə okruqun beş yerində cəmiyyəti-xeyriyyə, üç yerində misyoner şöbəsi və 317 yerdə üsuli-ətiq məktəbi bina olundu.

5) Keçən il məktəb şagirdlərinə çox böyük ianə verilib. Məsələn, ianə verib yardım edən zati-şəriflərin adları:

Vladiqafqazda.............. Məşədi Qoca,
Aşqabadda.................... Ömər Xoca,
Dərbənddə.................. Hacı Baba və cəmi qırmızısaqqallar,
Bakıda ......................... eks-agent Mirzə Zeynal və atstavnoy uçitel,
İçəri şəhərdə................ Tyomni ryad,
Genə Aşqabadda.......... Hüseyn Zal, Tuliyev, Molla Fırıldaq və kompaniya.
Mərvdə......................... Qraf Palinin dostu bir çinovnik,
Petrovskidə möhtərəm dərbəndli ağanın nuridıdəsi Keçəl Miri.

6) Keçən il hökumət divanxanasında ancaq 54354 nəfər adam yalandan and içib və keçən il əksər ovqat tətil olduğundan Qafqaz meşələrində ancaq altı yüz nəfər student çıxmışdır.

7) Qafqazın hər tərəfindən bu vaxta kimi 3792 qız köçüb, bunların hər birisi təzə ərinin evinə atası evlərində təhsil etdikləri elmlərə dair çox qiymətli kitabçalar, risalələr, romanlar və jurnallar apardılar. Məsələn, bu cümlədən olaraq: 75982 ədəd tumanbağı, 11326 ədəd çarıqbağı, 12072 ədəd möhürqabı.

Keçən yanvarın ibtidasından bu vaxta kimi möhtərəm dəlləklərimizin mübarək ülgüclərindən əvvəl-axır 389972 keçəl əmələ gəlib.

8) Keçən il müsəlman maarifi nəhayət tərəqqi eləyib və Daşkənddə təzə çap olunmuş 765 səhifədən ibarət «Dastani-Əbu Müslim sahibqiran» kitabı on iki min cilddən artıq bir ayın müddətində bircə Səmərqənddə və bircə də Daşkənddə satılıb. And olsun, bax, şimalda köhnə mərsiyəxanın keçən il Məkkədən gələndən sora sındırdığı tövbəsinə ki, yazılanlarda xilaf yoxdur.

Amma keçən il hədsiz yetimxanalar və şəfaxanalar açılıbdır, bu da müsəlmançılığın bərəkətindəndir.

*«Dəli»*

---

## MƏTBUAT

«Həqiqət»: Təbrik – «Fəxamətli müdir əfəndi həzrətləri» (böyük yazı ilə).

***Molla Nəsrəddin:***

Heyif ki, «şövkətli» sözü yada düşməmiş!..

***

«Səda»: Osmanlılar öz işlərini çox gözəl bilir, bizim «müdaxiləmizə ehtiyacları yoxdur».

*Məhəmmədəmin Əfəndizadə*

***Molla Nəsrəddin:***

Hə, yaxşı buyurur, onların dərdi bizəmi qaldı?

***

Genə: «Bu xüsusda xamərani-bəhsü məqal olmaqdan xali qalmayacağam».

***Molla Nəsrəddin:***

Qalma, əzizim, qalma! Bizim mətbuat meydanı Bakının Quba meydanından da genişdir.

İstər – «Xamərani-bəhsü məqal» ol, istərsən – «Əsbirəvani-fikri-zəlal»* ol.

***

Genə: «Hədisi-şərifdəki, eyyühənnas əttiqu fiddin illah» cümləsinə etibar edib ittifaq ediniz.

***Molla Nəsrəddin:***

Pəh, zalım oğlu, nə yaxşı ərəbcə bilir. Maşallah, maşallah.

***

«Vəqt»: «Qazan uyezdi zemstvası rusların ümumi oxumalarına qərar vermiş və müsəlmanlar üçün də plan tərtibini upravaya tapşırmış».

***Molla Nəsrəddin:***

Qazan kimi yüzdə doxsanı müsəlman olan bir şəhərdəki darülfünun və gimnaziyalara indiyə qədər bircə müsəlman balası da qoymayan Qazan şeyxləri hardadırlar ki, kafir ruslar özbaşlarına müsəlman balalarını oxutmaq istəyirlər?

---

## İKİ TELEQRAF

Bu gün idarəmizə iki əhəmiyyətli teleqraf gəlib: biri Tehrandan, biri də Təbrizdən. Tehrandan gələn teleqraf xəbər verir ki, Tehranda qərar qoyulub bir ilə qədər millət vəkilləri bir-birilə partiyabazlıq eləsinlər və ikinci ildə millət işlərinə baxsınlar.

Təbrizdən də xəbər verirlər ki, Nazimüddövlənin gədası gözünə eynək vurandan sora yollar əmin-amanlıqdır və maarif tərəqqidədir.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

* «Cəlal»ın nöqtəsini mürəttibimiz səhvən üstə qoyduğundan «zəlal» olub.




Mirzəağa Yusifxanov (ağlaya-ağlaya): Bu nainsaf oxucuların və dövlətlilərin biri də bu Qurban bayramında məscidlərə gəlmədi, vay, dədəm vay...

Mirza-aqa (сотрудникъ газеты): Зачемъ не идутъ мечеть въ день Курбанъ-байрама эти безсовестные интеллигенты и богачи: прости насъ – грешныхъ, – о Аллахъ!

1910 Beşimci il 1910 г.

ملا نصر الدين

№3 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 3




Litoq. S.Bıxova

– Ana, neçә gündür acımdan ölürәm, mәnә çörәk.
– Мама, я не еть несколько дней, умираю отъ голоду.
– Bala, atan on gündü başını yarıb, naxoş olub, işә gedә bilmir. Ağlama, bir az sakit ol, bәlkә gedәm qonşudan bir tikә çörәk alam.
– Дитя мое, отець твой ранил себя на «шахсей-вахсей» и лежитъ больной; потерпи, Аллахъ поможетъ.

## ƏDƏBİYYAT

Amandır bəhsi kəs, Molla, amandır biqərar olma!
Amandır eylə bəs, Molla, amandır xarü zar olma!

Amandır eyləmə hiddət gəlib qeyzə edib şiddət,
Müsəlmana edib nifrət, aman, tənqidi-kar olma!

Amandır, binəva Molla, qaranlıqdır hava, Molla,
Cahanda yox vəfa, Molla, aman, qeybətşüar olma!

Nə cövhər, nə ərəzdir bu, vücudunda mərəzdir bu,
Məgər səndə qərəzdir bu? Aman, biixtiyar olma!

Amandır eyləmə bidad, ucaldıb naleyi-fəryad,
Əhali dərdini tedad edib də dilfikar olma!

Bizə nə atəşə yandın, səməndərvar odlandın,
Bəhai, kafər adlandın. Qəmü dərdə düçar olma!

Dilində söhbəti-məktəb edirsən vird ruzü şəb,
Nədir məqsəd, nədir mətləb əyan et, şərmsar olma!

Büründün şeyx əbasına, girib molla libasına,
Soxuldun xəlq arasına, kənar ol, bərqərar olma!

Çəkil, dürtülmə ortaya, sataşma şeyxə, mollaya,
Verilməz pul bu kalaya, aman, qeybətnigar olma,

Kəsilmiş səbrü aramın, dolubdur zəhr ilə camın,
Yatıbdır qövmi-yamyamın, ayılmaz, intizar olma!

Demə bu əbdi mollaya ki, dursunlar tamaşaya,
Balonla övci-əlaya uçurlar, didədar olma!

Olar, danə rücuum var, sənin əslin füruun var,
Sücudun var, rükuun var, şəriətdən kənar olma!

Nədir xud əhli-Yevropa edirsən vəsfi-sər ta pa,
Nə oldu həzrəti-papa, buyur, bietibar olma!

Demə kim, xamdır millət, danış, biz də edək diqqət,
Nədir qəlbindəki niyyət! Di söylə, lal, kar olma.

Əbəsdir nəqli-hürriyyət, duyubdur fikrini ümmət,
Gərək təhsil edə övrət? Ona ümmidvar olma!

A birəhmi-cəfagüstər, deyibdir hansı peyğəmbər
Ki, getsin məktəbə düxtər? Belə binəngü ar olma!

Bax İncilə və Tövrata, əhadisə, rəvayata,
Nədir hürriyyət övrata? Amandır, qərqi-nar olma!

Ağarmış saqqalın, başın, keçibdir yetmişi yaşın,
Qırıldı yarü yoldaşın, dayanma, paydar olma!

Keçər bir gün giribanın əlinə əhli-imanın,
Qalar cismin, gedər canın, amandır, biməzar olma!

Düşərsən dəsti-cəlladə, yetişməz kimsə imdadə,
Gedərsən yoxluğa, badə, ənisi-murü mar olma!

Eşit vəzim, eşit pəndim, sənə zəhr olmasın qəndim,
Eşitdim mən də əyləndim, eşit sən də, fərar olma!

Amandır, eyləmə xidmət, verilməz xidmətə qiymət,
Götür, mollaya bax ibrət. Nihan ol, aşikar olma!

İnanma qövmi-gümnamə, bu əhli-Kufəvü Şamə,
Düşərsən axiri damə, amandır, qəmküsar olma!

Budur dörd il tamam oldu, sənə kim, söylə, ram oldu?
Eşit, xətmi-kəlam oldu, piyan olma, xumar olma!

*Məşədi Sijimqulu*



## DÜŞMƏNLƏR

Bizim oxumuşların bəzisi aşura günü düşür başyaranların qabağına və ağlaya-ağlaya dəstələr ilə bərabər dolanır. Bunlar iki qisimdir:

1) Bir qismi mömin çinovniklər və yarımçıq qoca «intelligent»lərdir ki, ölümün yaxınlaşmağını görüb, istəyirlər bəlkə asan vəchlə bir qədər savab qazanalar. Bu qisim «intelligent»lərimiz, filcümlə, yaxşı adamdırlar. Amma heyf ki, bir az axmaqdırlar.

---

2) Bir qismi də batində dinsiz, amma zahirdə özlərini camaatın nəzərində dindar qələmə verən oxumuşlarımızdır. Bunların çoxu qəzetə yazanlarımızdır. Amma içlərində tək-tək həkimlər və vəkillər də görükür. Bəzi də heç bir sənətin sahibi olmayıb, camaat arasında və camaat içində bəzi məmuriyyətlərə intixab olunmaq axtaran şəxslərdir və çünki bunların hamısı bir növ camaata möhtacdırlar, bu səbəbdən hər bir bicliyi qəbul eləyirlər ki, avama xoş gəlsinlər və bu yol ilə camaatı öz tərəflərinə çəkib nüfuz qazansınlar. Bunlar da yaxşı adamlardır, amma şarlatandırlar.

---

Söz yox, ağlamaq lazımdır.

Hər kəsdə vətən və millət məhəbbəti olsa, aşura günü çıxar bir uca yerə və müsəlman aləminə tamaşa eləyib, tez yenib gedər evinə və ikiəlli başına vura-vura deyər:

– «Ax, biçarə qardaşlar, ax uzunqulaqlar»...

Amma Allahın heyvanlarının oyunbazlıqlarına etina eləmək və nadan kərbəlayi və məşədilərin vəhşiliklərinə hələ bir növ gedib şərik olmaq haramzadalıqdır!

«Molla Nəsrəddin»in borcu keçəl qardaşları xəbərdar etməkdir ki, düşmənlərini tanısınlar.

Eşidən eşidər, eşitməyənin canı cəhənnəmə!

*Molla Nəsrəddin*

---

## OLMAZ

Vallah, olmaz, billah olmaz, olmaz, olmaz!

Mən ha deyirdim olmaz, – deyirdilər – xeyr, olar. Mən deyirdim – müsəlmançılıqda teatr olmaz – deyirdilər olar. İndi di gəl gör:

«Nicat»ın teatr dəstəsi Hacı İmaməli məscidində üç gecə şəbih gətirib.

Yaşasın «müsəlman» teatrı.

Yaşasın müsəlman rejissoru halvaçı Qıllı Beçə.

*«Dəli»*

---

## MƏTBUAT

«Bəyanül-həqq» qəzetəsi yazır: «Qorodskoy teatr arendasına doqovor proyekti... teatrın remontu üçün veşalkadan gələn doxoddan fond təşkil etmədi...»

**Molla Nəsrəddin**

Bax, nə deyim: «Təsfiyeyi-lisan» böylə olmalı ki, üç sətirdə bir türk sözü olmasın.

«Tərcüman»ın gözü aydın!

---

«Vəqt»: Bukləmə uyezdində müəzzin H. müəllim barəsində hökumətə danos verib məktəbi polisaya təftiş etdirdi.

**Molla Nəsrəddin**

Biçarə müəllimlər iki cəhənnəm atəşi arasında qalmışlar.

---

«Tənin», nömrə 469.

«Əslində bir-birinin öz qardaşı olan insanları yekdigərindən ayıran, bir-birindən sovudan, zülm və cəhalət hökm sürdüyü qədim əsrlərdə meydana çıxan bir para xəyalpərəst cahillərin fənnə, ağıla, hikmətə zidd olaraq icad elədikləri ideallar, amali-fikriyyənin ixtilafıdır. Halbuki indiki mədəniyyət əsri elm və fənn, ağıl və hikmət, müşahidə və maddiyyat dövrüdür.

İndi hər millət elm və mərifət təhsil etdikcə bir-birlərinə məhəbbət edir, bir-birlərinə yaxınlaşır.

İndi mədəni bir millətin borcu yalnız yaşamaq və torpaq davası etmək deyil, bəlkə beynəlmiləl ağıl və fikir davası edib, insanların dərd və kədərlərini mümkün mərtəbə azaltmaqdır...»

**Molla Nəsrəddin**

Əgər bu sözlər doğru olsa, dünyada ən birinci mədəni millət özümüzü hesab edib fəxr edərik. Çünki heç bir millət alimi insanların qəmlərini göz yaşı ilə azaltmaqda və başqalarından qan aldırıb sağaltmaqda bizim möhtərəm alim mərsiyəxanlarımızın ayaqlarının tozu da ola bilməz.

---

## LƏNƏT

Doğrusu xəcalət çəkirəm:

Bu gün müxbirimiz «Rəhmsiz» yazır ki, Qazan şəhərində bir nəfər müsəlman övrəti İzzətulina xanım Qurban bayramının günü teatr məclisi düzəldib və özü çıxıb teatr səhnəsində oynayıb.

Ax, ax! Bu da müsəlman arvadlarının oxumuşu.

Hələ deyirlər ki, «qızlarınızı dərsə qoyun».

Qoyana lənət!

---

Cəmiyyəti - İslamiyyə üzvləri

Rotter

– Cənab qubernator, Şurayi-islam məktəbinin
müəllimləri Osmanlıdan gəlib camaatı türk ittihadına dəvət edirlər.

Şurayi - islam üzvləri

Rotter

– Cənab qubernator, Cəmiyyəti-islamiyyə məktəbində də osmanlı müəllimləri var.
Bizim məktəbi bağlayanda gərək onlarınkını da bağlayasınız.

Hacıtərxanda.
Астраханъ.




Müəllim: – Dadaş, ordan bir sinəzən kitabı ver. Məktəb uşaqlarına təlim verəcəyəm.

İrəvanda İslamiyyə məktəbində

Rotter

– Qulluqçu saxlamasaq da olar. Hər şeydə qənaət lazımdır.
– Можно обойтись и безъ сторожа.

## QARABAĞLILARDAN RAZILIQ

Molla dayı, istəyirəm Gəncədə olan qarabağlılardan və ələlxüsus peyğəmbərin qız nəvəsi o balaca qarabağlıdan sizin jurnalınız vasitəsilə hamıdan əvəz olub (elə bu barədə hamı vəkillik veriblər) bir razılıq yazam.

Söz orasındadır ki, neçə il bundan qabaq bizim məhərrəm dəstgahımız çox rövnəqsiz idi. Məhərrəm olanda görürdün ki, gecələr bir neçə adam bir yerə yığılıb bir az şaxsey deyib, gedib bir az da məsciddə ağlayıb, dağılardılar. Aşura günü də olanda hər küçə on nəfər adamı bir yerə yığa bilməzdi ki, baş yarıb, ağköynək olsun. Amma indi... İndi bu başlarına döndüyüm qarabağlı qardaşlarımız işə qarışandan bəri məhərrəmlik büsatımız günügündən tərəqqi etməkdədir. Bircə gəlib Zərrabi küçəsinə çıxaydın, bircə görəydin qardaşlarımız nə büsatlar cəm etmiş idilər. Gecələr neçə yüz şaxsey deyənlərimiz, zəncir vuranlarımız, şəbih çıxardanlarımız, nə bilim nələrimiz var idi. Tasua günü bir gunə şəbih bəzəyib küçələri gəzdilər ki, görənlərin ağızlarının suyu axırdı. Aşura gününün dəstgahı bir başqa idi. Bayaq ağköynək olmaq üçün on adam tapılmırdı, indi qarabağlı qardaşlarımızın bərəkətindən bircə Zərrabi küçəsində yüzə kimi başyaran var idi. Hələ zəncirvuran, ələmdar, kəcavə, Qasim otağı, bunların hamısı dursun kənarda. Bundan əlavə bir Haris şəbihi bəzəmişdilər ki, sifəti lap it sifəti kimi idi (çünki onlar öləndən sora it sifətinə düşürlər). Zülcinah barəsində heç bir deyəsi söz yoxdur. Keçən il Zülcinah çox möcüzələr göstərdi. O cümlədən, biri də bu oldu ki, doğmayan bir övrəti doğuzdurdu (hərçənd Seyid Fəqir ağa da iddia eləyir ki, onun doğmağı mənim duamın bərəkətindəndir, amma yalan deyir, bu möcüzəni bu Zülcinaha yazmaq olar). İndi gəl gör bu il nə büsatlar oldu. Zülcinahın altından beş yüzə kimi övrət keçdi. Balaca qarabağlı atın başını tutmuşdu, uşağı da quyruğunu. Və hər övrətdən bircə manat alırdılar. Müxtəsər, qarabağlı qardaşlarımızı Allah biz gəncəlilərə çox görməsin, hərgah bir neçə il də bu sayaq getsələr, onda tərəqqi edib, lap on səkkizinci göyə çıxarıq. Allah onlardan razı olsun.

*Hamıdan əvəz*

---

**İdarədən:**

And olsun yeri-göyü yox yerdən yaradan Allaha ki, bu qarabağlılar olmasa, məhərrəmlik günləri biz müsəlmanlar xarici millətlər içində utanıb yerə girərik. Məsələn, bu il Tiflisdə Qarabağ dəstəsinin tamaşasına az qalmışdılar Firəngistandan əkkaslar gəlib tamaşa edələr. Xülasə, məhərrəm barəsində biz Qafqaz müsəlmanları nə qədər ki, canımız sağdır, gərək təşəkkür edək, əvvəl iranlı qardaşlardan və saniyən qarabağlılardan. Allah öz birliyi xatirinə, ildə on gün mömin və 355 gün mərdüməzar müsəlman qardaşların nəzirini dərəceyi-qəbula yetirsin.

---

## TƏZƏ TELEQRAF

Tehran: Ətəbati-aliyədən ələl-əcəl beş molla xızrsifət məclisi-millinin imdadına yetişdilər.

---

## FELYETON.
## QƏBİRDƏN MƏKTUB

Mən hələ buraya köçməmiş, yəni şəhərdə ikən yoldaşlarımla neçə dəfələr Cümə məscidi məktəbində yığışıb, məktəbin tərəqqisi xüsusunda müzakirələr edirdik. Məktəbi daha artıq rövnəqləndirmək, böyütmək istəyirdik.

Hərçənd indiki məhəllə yoldaşım Qazi Məhəmməd əfəndi çox vaxt müzakirəmizi pozub ortaya belə bir müzakirə atırdı:

Gecə yatanda paxlava yeməkmi xeyirlidir, yoxsa camış qaymağımı?

Qazinin bu sualını həll üçün yoldaşlarım ikiyə bölünürdü: kimi paxlavanın sinəgirlərə, dizlərə qüvvət verdiyini, kimi qaymağın qocaları cavanlandırdığını iddia edirdi.

Bununla belə genə arabir məktəb fikrini eləyirdik. Az-çox iş görürdük.

Ol vəqt ondan artıq da iş görmək də olmazdı. Hamı ilə bərabər mən də deyirdim ki, millətimiz üçün çox şey istəmək hələ tezdir, camaat avamdır, görmədikləri şeylər ilə bunları ürkütmək ağıl deyil.

Hər şey yavaş-yavaş olar – deyirdim.

Şəhərdən qəbristan məhəlləsinə, bu sakit aləmə köçməyin yaxınlaşdığını duydum. Fikir etdim ki, sağlığımda millətimə layiqli bir xidmət edə bilmədim, etməyi bacarmadım. İndi o biri aləmə köçürəm, yaxşısı budur ki, evlərimin cümlə əşyasını, yerlərimi millətimin maarif işlərinə vəsiyyət edəm. Gələcəkdə millətimin gözü açılar, vəqflərim ilə çox mənfəətli işlər görər - dedim.

Ağlım yerində olduğu halda yanıma dörd-beş mötəbər adam çağırdım, onları şahid tutub hər şeyimi millətin maarif işlərinə vəqf etdim.

Bir az zaman sora, indiki aləmə köçdüm. Çox çəkmədi, ruhuma paltar hökmündə olan bədənimi qurdlar, əqrəblər yedilər. Mən, yəni ruh təkcə qaldım. Neçə vaxtdan bəridir ki, cümə axşamı günləri şəhərə gəlib dolaşıram.

Keçən həftə genə şəhəri, xüsusən öz qohumlarımı dolaşmağa gedirdim. Yoxuşun aşağısında Qazi Məhəmməd əfəndiyə rast gəldim ki, o da şəhəri dolaşıb yerinə, yəni qəbrinə gəlirdi. Gördüm halı çox pərişan. Mən sual etmədən başladı ki: «Yoldaş, heç getmə! Məscid məktəbinin halını, şəhərin ağalarını, hələ bizim əski yoldaşların məşğuliyyətlərini, işlərini görsən peşiman olarsan. Bizim vaxtımızda genə bir zad, bir qeyrət, bir iş var idi.

Güman edirdim ki, Şəki beş-on il sora özgə cür tərəqqi edər. Amma gördüm ki, doğrudan da, özgə cür, yəni başıaşağı tərəqqi edir».

– Yaxşı, bizim qohumlar nə halda? – deyə sual etdim.

Başladı ki: – Of, onları heç soruşma. Məscid məktəbində idim, bir də duydum aşağı tərəfdən səs-küy gəlir, tez o tərəfə yüyürdüm, akoşkanın deşiyindən içəri girdim. Gördüm bir qiyamətdir qopur: «Məclis bir zad qayıra bilməz, Əbdüssəlam ağanın qanuni vəsiyyəti yoxdur, hər nə malı qalıbsa bizimdir. Dəli deyilik ki, öz malımızı Allahın kasıb-kusublarına dağıdaq, çox da ki, dörd-beş kişinin yanında vəsiyyət eləyib, kağızı yox, bir zadı yox...» səsləri ucalırdı.

Mən yoldaşımdan bu sözləri eşidincə dəxi şəhərə getmək, onların üzünü görmək istəmədim: geri qayıdıb yerimə gəldim. Və hər dəqiqə Allaha yalvarıram ki, ilahi, işlər sənə əyandır, sən bilirsən ki, hər şeyimi millətimin maarifi yoluna vəqf eləmişəm.

İlahi, sən mənim arvadımın, bacımın, qaynımın, yeznəmin ürəklərinə mərhəmət hissi burax! İlahi, sən onları haqq yoluna çağır ki, mənim vəqflərimə tamah edib özlərini dünya və axirətdə bədbəxt eləməsinlər!

İlahi, sənə əyandır ki, əgər mənim vəsiyyətimi puç edib millətə vəqf elədiyim malları yesələr, qiyamətə qədər ağlayıb haqqımı istəyəcəyəm!

İlahi, sən mənim qohumlarıma elə pis, murdar tamah vermə ki, sənin şiddətli intiqamına, camaatın əbədi lənətinə düçar olalar.

*Əbdüssəlam ağa Qaziyev*

## TELEQRAF XƏBƏRLƏRİ

Buxara – Sünnülər ilə şiələr «Din və məişət»in istədiyi kimi, öylə ittifaq edib qucaqlaşdılar ki, məhəbbətin şiddətindən yüzə qədər müsəlman şəhid oldu.

---

Şamaxı – Hacı Əbdürrəhim əfəndi öz evindəki yüksək rəsədxanasından böyük aftaba durbini ilə quyruqlu ulduzun hərəkətini təftiş edir.

Bu barədə yazacağı məqaləsini köhnədən yazıb Peterburqa göndərdiyi heyət kitabına əlavə edəcək.

---

Gəncə – Məhərrəm münasibəti ilə göydə dəhşətli bir quyruqlu ulduz görünməyə başladı.

Molla Məşum kəşf edib ki, bu quyruqlu ulduz məhərrəmdə baş yarmayanların başına düşəcək.

---

Tiflis – Buradakı iranlılar məhərrəmdə cənab şeyxülislam ilə Molla Nəsrəddinin acığına o qədər şiddətli baş yardılar ki, rus hökuməti qorxuya düşüb Ərdəbildəki qoşun komandirinə teleqraf ilə əmr etdi ki, qoşunu Ərdəbildən Tehrana tərəf çəksin.

---

İrəvan – Buranın bəzi dinsiz cavanları şəbihə şəkk gətirməklərinə görə zəlzələ mələkləri şəhərimizi bərk titrədib oynatdılar.

---

## ŞƏRİƏT ƏMUDU

Cənab Ağa Seyid Abdulla Bəhbəhani Tehrana gələn gündən, yəni səfarəti-dövləti-faximə ilə bazdiddən sora bu xəyala düşüb ki, şəriət əmudu qayıtdırsın. Ona binaən gecə-gündüz ağanın müridləri və bir neçə nəfər mahir ustad çox təcil ilə əmudu qayırmağa məşğuldurlar. Ağa əmudu götürüb gedəcək vəziri-ədliyyənin qapısın bağlasın, necə ki, o, mollaların qapısın bağlayıb. Oradan gedəcək vəziri-maarifin başına bir əmud vurub və cəmi təzə məktəblərdə oxuyanları və qəzetəçiləri kafir eləyib cəhənnəmə atacaq ki, onlar köhnə üsulu cəhənnəmə atıblar bəs deyil, hələ indi başlayıb hürriyyəti-zənan söhbəti də danışırlar.

Bu zərbətə Təbriz əncümənində və Nəcəfdə Molla Qurbanəlidən «əhsən», «əhsən» səsi ucalacaq. Oradan salavat çəkə-çəkə «va şəriəta» deyə-deyə gələcək vəziri-maliyyənin qapısına bir əmud vurub tamam vəzarəti tarmar edəcək ki, məşrubata aqsiz qoymaq bəs deyil, hələ yavaş-yavaş mövqufata da əl uzadıb istəyirsiniz şəriəti tarmar edəsiniz. Bu zərbətin səsindən tamam iranlılar diksinib deyəcəklər:

Zərbətu Məhəmməd Əli və Əmiri-Bahadır əfzəlün min zərbəti Seyid Abdulla.»

---

## POÇTA QUTUSU

Mərvdə «Zəvvar»a: Məşhədi-müqəddəsdə zəvvarlar üçün siğeyi-mütənin iddəsi yoxdur. Nahaq yerə axundun təklifinə razı olmayıbsınız və fürsəti fövtə veribsiniz.

---

Culfada «Cüvəllağı»ya: «Nəsihət» çap olunmayacaq.

---

Bakıda «Hərcayı»ya: Nəsr ilə yazdığınız məqalə qəzetə üçün çox layiqlidir, amma jurnalımıza əl verməz. Nəzminiz çap olunur.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

Персидское консульство
İran konsulxanası.




Naib
Sinəzənütdövlə: İran konsulu axund Mərsiyə ülməmalik
*Консулъ*

## ƏDƏBİYYAT

Vaizlərə bax gör necə təqrir ediyorlar,
Möminləri qılman ilə təbşir ediyorlar.

Ruhun çıxarır cismdən ərbabi-behiştin,
Behcət verərək dillərə təmir ediyorlar.

Bir tac qoyub başına cənnətdə qızıldan,
Ləbbadəni, həm caməni təğyir ediyorlar.

Məşrutəçilər cəm olunur ziri-əbayə,
Məşrutəni məhv etməyə tədbir ediyorlar.

Derlər ki, cəhalətdədir əbqayi-tədəyyin,
Cahilləri də böyləcə təbxir ediyorlar.

Arifləri, alimləri bidin oxuyurlar,
Ahilləri, kahilləri təthir ediyorlar.

Köhnə çürümüş sözlərini nəqdə satırlar,
Milli yeni söhbətləri təkdir ediyorlar.

Jurnal, qəzetə ziddi-şəriətdi deyirlər,
Qarelərini yeksərə təkfir ediyorlar.

Zahidləri sərsüfrədə əyləşdiriyorlar,
Bir nəhv ilə əmsalını təksir ediyorlar.

Mollalara irad edəni taptalıyorlar,
Kəndi günəhin hər biri təstir ediyorlar.

Minbərdə fəsad əhlinə lənət oxuyurlar,
Xud molladanosbazları təqdir ediyorlar.

Min gunə təməllüq ediyorlar ümərayə,
Adabi-təvazö deyə təbir ediyorlar.

Hürriyyəti-nisvan deyəni həbsə alırlar,
Arifləri hər növ ilə dilgir ediyorlar.

Bundan sora jurnalları gizlin oxuyun ha!..
Həp qətlinizə hökmdü, təhrir ediyorlar...

*Kefsiz*

## DİN

Mən çox qorxuram bir vaxt ola ki, din əldən gedə və buna neçə dəlillərim var:

Bu il məhərrəmlikdə Xasayurt ağsaqqalları iki yüz əlli manat verib rövzəxan Molla Əbdülhüseyn cənablarını gətiriblər ki, mərsiyə oxusun. On günün ərzində mərsiyəxan cənabları iki yüz əlli söz danışdı. Yəni sözün birini bir manata satdı və bu gözəl sözlərin biri də bu idi ki, «Həzrət Abbas təpiyi ilə yüz həştad min qoşun öldürdü...»

Xülasə, bunun sənə və mənə dəxli yoxdur: pul xasayurtluların, rəvayət də Molla Əbdülhüseynin. Amma sənə və mənə dəxli olan budur ki, təzə ərsəyə gələn cavanlarımız Molla Əbdülhüseynlərin rəvayətlərini yada salıb məsciddən qaçacaqlar. Onda da işlər xarab olacaq.







---

Məsələn, gəl gedək Xoy şəhərində məscidə. Biçarə qardaşlarımız bir əlində süfrə və bir əlində palçıqlı başmaqları, süfrəni məsciddə yerə döşəyib, başlayırlar küftə yeməyə: cığ-vığ, arvad-uşaq, şəbih, mərsiyə, bişmiş noxud, yer alması, göz-qaş, göz yaşı, baş yarmaq və balaca uşaqların ayaq altında əzilməyi!..

Bu nədir?

Bu, ibadətdir.

Pəh, pəh! Pəh, pəh, pəh! Ay din alan! Ay yaponlar, haradasınız. Gəlin, gəlin, başınızı yarın.

Qorxuram tüpürüb qaçalar.

---

Bizarafat deyirəm ki, hər kəs rastıma gəlir, hamısını yavaş-yavaş dinə soyumuş görürəm. Niyə və nədən?

Günah özümüzdədir.

---

Nə qədər ki, indiyədək Naxçıvanda xan vəfat edib, onların çoxu can verəndə də araq və çaxırsız can verə bilməyiblər. Münacat çəkilən kimi qazilərimiz əbalarının qollarını geyinib, uşaq kimi qaçıblar ki, xan qapısında rəiyyətlər ilə şaxsey getsinlər və qırx gün təziyədə mücavirlik etsinlər. Amma bu günlərdə haman Naxçıvanda bir nəfər cavanı dəfn etməyə qazinin əmri ilə bir müsəlman da getməyib. Niyə? Mərhum çaxır içərmiş.

Budur bizə müsəlmançılığı göstərənlər!

Göyçayda zalım oğlu hamamçı Məşədi Nağının gözü Molla Nəsrəddini görür. Di bir gəl Naxçıvana; gəl bir müsəlmanlara da tamaşa elə. Gəl şəriətmədarları gör ki, gözağrısı görməyəsən.

---

Buxarada da sünni və şiə alimləri öpüşdülər. Danabaş kəndinin arvadları burda olaydı, deyəydi: ay görüm sizin dodaqlarınız qurusun öpüşdüyünüz yerdə!

Avam nə bilir sünni nədir, şiə nədir? Molla öyrədib.

Avam nə bilir ki, şiə sünninin və sünni şiənin düşmənidi. Molla öyrədib.

Söz yox ki, əgər əmmaməli qoçularımız bir ay bundan qabaq öpüşsəydilər, bu qırğın da olmazdı. Amma görsənən budur ki, belə məsləhət imiş.

Bakı ariflərimiz də mollaların bu əməllərini görüb deyirlər ki: «Vallah, belə müsəlmançılıqdansa yaxşısı budur ki, gedib rus olaq». Odur ki, bu il rusların yolka bayramlarında hər müsəlman evində bir yolka ağacı bəzəmişdi ki, rus tanışları və rus böyükləri görüb ağadan razı qalsınlar.

Xülasə, bunun nə sənə və nə mənə dəxli var! Hər kəs istər, aparıb pulunu verib, yolka alıb bayram saxlar. Amma bizə dəxli olan budur ki, camaatımızın bir hissəsi indidən əcnəbilərin bayramlarını xoşlayıb (nəinki elm və sənətlərini) başlayıblar onlara qarışmağa.

Bir tərəfdən də məhərrəmlikdə Təbrizdə aslanlar bəzəyib, Gəncədə övrətləri dəvələrə mindirib və hər yanda hər cür oyunbazlıqlar çıxardıb, dünya və aləmi heyrətə gətiririk.

Mən elə qanıram ki, bunların hamısı dinimizin yavaş-yavaş əldən getməyinin əlamətidir.

Pənah Allaha.

*Molla Nəsrəddin*

---

## TƏZƏ İLİN KƏŞFİ-KƏRAMƏTİ

İşbu min doqquz yüz onuncu il dünyaya qədəm qoymayıb, məgər müsəlmanların iftixar və baş ucalığına. Belə ki, bu ilin əvvəlindən başlanmış bir gün və bir saat olmur ki, bir möcüzə və bir xariqüladə iş meydani-zühur və büruzə çıxmasın.

1) Götürək müsəlmançılığın ən böyük nöqtəsi olan Təbriz şəhərini. Bu vilayətdə qırx-əlli ildən bu yana tutulmamış təziyələr tutulub, oxunmamış mərsiyələr oxunub, yarılmamış başlar yarılıbdır. Və hətta urusu başların qırxılmasına Əncümən tərəfindən hökm sadir olub, çox bərk qadağan olunubdur ki, bundan sora heç kəs başını tüklü saxlamasın.

2) Naxçıvanda cənab şeyxə kasıb və biçiz, ac və fəhlə camaatdan doqquz yüz doxsan doqquz manat pul yığılıbdır və bir nəfər məhərrəmdə xilafi-şər eləyib keflənməyə görə birdən partlayıbdır. Şəhər əhli bu möcüzənin şərəfinə güldəstələrdə, məscidlərdə, məhəllələrdə şamlar və məşəllər yandırıb çırağban ediblər və qazinin fitvasına görə nə camaatdan və nə ruhanilərdən onun təşyini-cənazəsinə heç bir kimsə getməyibdi.

3) İrəvanda bir şikəst oğlanı anası məscidə dəxil salıb, bir-iki saatda salamat və təndürüst olubdur.

4) Ordubadda məsciddə bir nurani seyid zahir olub, xalqa mərsiyə və növhə oxuyub ağladandan sonra minbərdən qeyb olubdu.

5) Culfada indiyədək görülməmiş təziyədarlığı eləyib, Qasim otağı bəzəyib, baş yarıblar.

Bu möcüzə və kəramətlərin bərəkətindən camaat məscidə və təziyə büsatına hər ildən artıq canfəşanlıq edib mollalara və seyidlərə hər ildəkindən artıq pullar veriblər. Şaxsey dəstəsinə və ağköynək dəstəsinə hədsiz rövnəq veriblər ki, xaricilər müsəlmanlardan hesab aparsınlar. (Odur ki, Naxçıvanda bir erməni nəzir eləyib ki, hərgah filan hacəti rəva olsa, aşura günü baş yarsın. Və hacəti rəva olub. Haman gün yuxuda bir göy atlı ona deyib ki, get vədinə vəfa eylə. Boylum o da gəlib bazar məscidində baş yarıbdır.)

Müxtəsər, Bakıda laməzhəblər dəstənin bayıra çıxmasına mane olsalar, yüz o qədər sair şəhərlərdə şaxsey dəstgahı ilbəil həzrətin səfayi-batinindən rövnəqlənəcəkdir. Bakıdakı şiə qardaşlarımız heç diltəng və övqattəlx olmasınlar.

Yaşasın Qafqazda olan həmşərilər.

*Otaylı*

---



– Qazi, Allah eşqinə, məni bu zalım ərimin əlindən qurtar.

– Çünki ərin razı deyil, mən səni boşaya bilmənəm.

Köpəyin qızı, sənə nə ki, mən piyanam və gecələr evə gəlmirəm.

**Şurayi - İslam üzvləri**



**Rotter**

Kef mənim, ixtiyar mənim, təzəsini alaram, köhnəsini boşaram.




– Qazı ağa, övrətimi boşamaq istəyirəm, çünki təzə övrət alıram.

Qazi: – Bəli, şərən ixtiyarın var, boşaram.

– Vallah, zalımın qızı nə gözəldir. Bunu alaram, arvadımı boşaram.

Molla: Rəhməti-ilahiyyə tək müsəlmanlara deyil, kafirlərə də yetişəcəkdir.

Molla Nəsrəddin: Görəsən, rəhməti-ilahiyyəni müsəlman arvadları da görəcəklərmi?..

Rotter

## TELEQRAF XƏBƏRLƏRİ

Odessa – Şahın İrandakı dostları uzun fəraqa təhəmmül edə bilmədiklərindən bu axır vaxtlarda Astaradan, Ərdəbildən, Təbrizdən, hətta Tehrandan ziyarətə gəlirlər.

Ziyarətin səbəbi məhz şiddəti-məhəbbətdir. Siyasi, fəsadi bir qəsd yoxdur.

---

İstanbul – Sultan həzrətləri qurban bayramında buynuzları altun vərəqlər ilə bəzənmiş qoçları ziyarət və tamaşa edəndən bəri xeyir və bərəkət artmaqdadır.

---

Axalsix – Pusxov camaatı «Darülpuşayan»ın mədrəsəsinə ildə min pud taxıl haqq verirlər ki, mədrəsədən puşalıq şəhadətnaməsi alıb, İbrahim əfəndi kimi puşalıqda kamil olsunlar.

---

Peterburq – Dumadakı sağ firqə qubalı Hacı Molla Babanın qarnı kimi şişir, ağacı kimi güclənir.

---

Orenburq – Bu günlərdə rəhməti-ilahiyyə ilə fitneyi-şeytaniyyə şiddətli çarpışır. İkincinin qırmızı zəfər bayrağı «Din və məişət» idarəxanasının üstündə görünür.

Molla Nəsrəddin: Buxara müsəlmanlarına müjdə!

---

Tehran – Cənab Ağa Seyid Abdullaha Nəcəfdən belə bir hökm sadir olub ki:

1) Natiqlər ağadan izn almamış danışmasınlar.

2) Övrətlər faytona minməyələr və mümkün qədər evdən eşiyə çıxmayalar.

3) Kişilər axşam saat altıdan sora evlərində ucadan öskürməyələr və

4) Hər kəs hürriyyət sözünü dilinə gətirsə, tez adını siyahi edib Təbrizdə vaiz Hüseynə göndərsin.

---

Tehran – Ordubadda itən Molla Şükürün falaqqası «İqbal» mədrəsəsinin müəllimi İsmayılovda tapıldı.

---

## ELANİ-RƏSMİ

Nuxa camaatı tərəfindən rəsmi surətdə elan olunur ki, bu aprel ayında Nuxa şəhər idarəsinin torğu başlanacaq, yəni qlava və qlasnı seçkisi əmələ gələcək. Xahiş edənlər üçün özgə bir dokument lazım deyil, ancaq beşcə yüz manat cibinə qoyub gəlsin və əgər pulu olmasa, məhkəmeyi-şəriyyə idarəsindən, yainki qazidən bir şəhadətnamə gətirsin ki, namazı heç bir gün də qəzaya qalmayıbdır.

*Şəhər idarəsi tərəfindən*

---

## MƏTBUAT

«Bəyanül-həqq», nömrə 563:

Əlhəmdülillah sümmə əlhəmdülillah (bəd sümmə əlhəmdülillah) kəmali-rahətlik ilə Məkkəyə gəlib mövlana əşşeyx Məhəmməd Murad əfəndinin xaneyi-dövlətlərinə mehman olduq.

*Əbdürrəşid İbrahimov*

---

### Molla Nəsrəddin

Sümmə, sümmə və sümmə əlhəmdülillah ki, mövlana əşşeyx əfəndinin xaneyi-dövlətlərinə mehman olmuşsunuz. Qazanlıların gözü aydın!

---

Genə Məkkəyə gələndən etibarən mən hərəmi-şərifdə vəzə çıxıb türki və ərəbi lisanlarında xütbələr oxumağa başladım. Hazirun iki-üç mini mütəcaviz idi. Əhrar və zabitan hazır olmaqdadır.

*Ə.İ.*

---

### Molla Nəsrəddin

Atana rəhmət, bax, indi öz yerini tapdın. Burada o qədər xütbə oxu ki, gözü sürməli, saqqalı boyalı hacıların ağızlarının suyundan təzə bir ümman meydana gəlsin.

Axır kafər yaponlar sənin fəlsəfi, tarixi, ictimai məlumatını nə bilirdilər ki, cəmiyyətlərində xütbə oxuyaydın?!

---

## YALAN

Biz həmin nömrədə teleqraf xəbərlərində yazmışıq ki, Ordubadda itən Molla Şükürün falaqqası Tehranda «İqbal» məktəbinin müəllimi İsmayılovda tapıldı.

Amma çox təəccüb edirik ki, bir belə xəbər bu günlərdə bizə Göyçaydan da gəlib çatıb. Söz yox, iki xəbərin biri yalandır... Biz belə başa düşürük ki, Göyçay müxbirimizin yazdığı böhtan və düşmənçilikdir. Səbəb budur ki, müxbir məktubunun axırında yazır ki, müəllim çəkməsinin üzünü və altını uşaqların qarnında təmizləyir... Biz bilməyirik ki, burada xilafi-qayda nə bir iş var.

---

## PROTEST

Eşidirik ki, baş yarmaq və şəbih gətirməyin icad və şərəfi bundan altı-yeddi yüz il əvvəl gələn bəzi müqəddəs şəxslərə nisbət verilir. Halbuki bu üsulu dünyada ən əvvəl biz icad və təsnif eləmişik. Bu xüsusda əlimizdə tarixi dəlillər var. Hər kəs gərək bilə ki, bu üsulu bundan

yüz il əvvəl dünyanın heç bir tərəfində heç bir nəfər də bilməzdi. Hətta belə şey ola biləcəyini bir mömin də ürəyindən keçirə bilməzdi.

Hər halda bu gözəl üsulun müvəccidi məhz bizik. İcadımızın əhvalatı bu növdür:

Bundan yüz il əvvəl Qarabağ xanı İbrahim xan bir neçə təqsirlinin boyunlarını vurmağı əmr edir. Müqəssirlərin tərəfdarları əhvalatdan xəbərdar olub, xanın vəziri olan Molla Pənahın yanına təvəqqeyə və məsləhətə gedərlər. Vəzir onlara məsləhət edir ki, müqəssirlər ağ köynək geyib, başlarına xəncər vura-vura, fəryad edə-edə xan sarayının qabağından keçib siyasət meydanına getsinlər. Müqəssirlər də həmin sayaq üzrə əməl edib, xanın nəzərinə çatınca, xanın xoşuna gəlib müqəssirləri bağışlar.

Xanın xoşuna gələn bu əhvalat o gündən sora hər il təkrar olunub getdikcə tərəqqi tapır.

Həqiqətdə də tərəqqi tapmalıdır.

Həqiqətdə də cavanlar dəstə ilə ağ köynək geyib küçələrə dolanan minlərcə camaatın tamaşaları qarşısında baş yara-yara, növhə oxuya-oxuya keçmək, bu büsat ilə şəhərə görünməmiş həngamə salmaq, hər kəsin, xüsusən qaraqaşlı qızların nəzərini cəlb etmək özgə bir xoşbəxtlik, hər vaxt ələkeçməz özgə bir zövq və nemət idi.

---

Bir vaxt gəldi xan da, Molla Pənah da vəfat etdilər. Bunlardan sora dünyanın işləri də dəyişməyə başladı. Biz də zəmanəyə uyub işlərimizi dəyişdirməyə, xüsusən xan üçün tərtib etdiyimiz ağköynək büsatını çevirib həzrət İmam Hüseyn adına eləməyə məcbur olduq. Və o zəmanədən bəri də boş durmayıb bu gözəl icad və adətimizin tərəqqisinə əlimizdən gəldiyi qədər çalışdıq. Bu çalışmamız sayəsində bu gözəl icadımızı dünyanın hər tərəfində qəbul etdirdik. Bundan sora da bu icadımızın davamına can-başla çalışacağıq. Ancaq burası var ki, bizim qəsdimiz, hər fəndlə olsa, bu icadımızın hər tərəfdə qəbul olunması idi. Buna da ki, həmd olsun, mərsiyəxanlarımız sayəsində gözlədiyimizdən artıq nail olduq. Dəxi bundan sora müsəlmanların başını kəssən də bu gözəl adəti tərk edə bilməzlər.

İndi insaf deyil bu qədər zəhmətimiz əvəz və mükafatsız keçsin, bir para bixəbərlər icadımızı danıb özgələrə nisbət versin.

Bu neçə illərdir sükut edib icadımızdan nəfbərdar olmağa təşəbbüs etməməyimiz məhz din və millətimizin tərəqqisi mənzuru ilə idi. İndi ki, həmd olsun, millət məşrutə alıb ərşi-əlayə qalxdı, dəxi icadımızdan Amerika icadçıları kimi imtiyaz alıb istifadə etməmək kari-aqil deyildir.

Buna görə biz qarabağlılar bu həftə məscidə yığışıb qərar qoyduq ki, içimizdən bir neçə başbiləni seçib Tehrana göndərək ki, İran millət məclisindən bizim üçün ağ köynəklə baş yarmaq və şəbih gətirmək oyunlarının imtiyazını alsınlar.

Bu səbəbə hamı müsəlmanlara bu elan ilə müraciət edib şiddətli protest edirik ki, bundan sora bizdən rüsxət almamış «baş yarmaq və şəbih gətirmək» oyunlarını çıxarmağa heç kəsin ixtiyarı yoxdur.

*Qarabağ camaatı*

---

Molla Nəsrəddin: oxucularımızdan təvəqqe edirik ki, hər kim bu oyunların ən əvvəl Qarabağdan savayı bir özgə yerdə başlandığını bilirsə, tezliklə bizə xəbər versin ki, imtiyaz almalarına mane olaq, yoxsa müsəlman aləminin evi yıxılar.

## BİR STATİSTİKA

Cənab Molla Nəsrəddin! Özümə borc bilirəm sizin möhtərəm jurnalınızın vasitəsilə elədiyimiz əzim bir tərəqqini aləmi-islama ümumən, Qafqaziya müsəlmanlarına xüsusən bildirəm. Min üç yüz iyirmi yeddinci ilin məhərrəmlik dəstgahıyla bu ilinkini bərabərləşdirdikdə iravanlıların böyük, çox böyük bir tərəqqiyə nail olduqları görünür. Bu tərəqqini haman aşağıdakı statistikadan bilmək olar.

## STATİSTİKA

| | *1327-ci ildə* | *1328-ci ildə* |
|---|---|---|
| Baş yaran: | 1456 adam | 2355 adam |
| Qan aparan: | 118 adam | 295 adam |
| Zəncir vuran! *(*)* | 258 adam | 548 adam |
| Muzik *(**)* | 2 dəstə | 5 dəstə |
| Başmaq oğrulanması *(****) | 8465 cüt | 14555 cütə baliğ |
| Şəbih truppası: | 3 truppa | 7 truppa |

*İmza: Fırıldaqçı*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

### ELAN

Gəncə şəhər idarəsi tərəfindən 1910-cu ilin yanvar ayının ibtidasından açılması müqərrər olan rusi-müsəlmani qız məktəbə bir müəllimə lazımdır ki, pedaqoq elmindən xəbərdar olub, türkcə yazıoxu bilməsi şərtdir. Maaşı ildə dörd yüz manat olub, odun, neft, otaq, nökər pulu şəhər idarəsinin öhdəsinədir.

Xahiş edənlər kəsbi-ləyaqət şəhadətnaməsilə bərabər şəhər idarəsinə rücu etsinlər.

---

*) Keçən il zəncir vuranlar ancaq məscidin içində vururdular, amma bu il soyuqdan əsla qorxmayıb çıl və çılpaq məscidin həyətində və küçələrdə vururdular.

**) Ağa saldatlar çaldıqları «vals və mazurka» adamın gözlərindən sel kimi yaş tökülməyə bais olurdu.

***) Başmaqdan savayı, bu il Göy məsciddən beş ədəd xalı oğurlayıblar.



Günahı budur ki, əri yox olandan dörd il sora gedib bir özgə kişiyə.



Natiq: – Camaat, din əldən getdi, övrəti gərək səngsar edək.




İranda Koçan şəhərində.
Въ Кочани (Персия)

İyirminci əsrdə İran ədliyyəsi.

2 səfər 1328 | Beşimci il | 31 января 1910 г.

# ملا نصر الدین

№5 Qiymәti 12 qәpik. | МОЛЛА НАСРЕДДИНЪ | Цена 12 k. № 5




Dūvəli-hamiyə: – Çox qızışmaq lazım deyil.

Litoq. S.Bıxova



## NİSKİLLİ

Sən deyirsən, Molla, mən biçarə arvad almayım?!
Evdə bir ifritə vardır, bir pərizad almayım?!

Neyləyim bəs almayım bir dilbəri-mehparə mən?!
Gəlmişəm bu adi arvadın əlindən zarə mən.
Olmuşam pabənd bu heyvana, bu kaftarə mən,
Yanmışam, billah, sənin başın üçün, odlarə mən.
Bəs gedib bir dilbəri-xoşruy alıb dad almayım?!
Evdə bir ifritə vardır, bir pərizad almayım?!

Molla, insaf eylə, yarım, yoldaşım evləndilər,
Tazə arvad aldılar, aldıqda seyqəlləndilər,
İş görüb ad aldılar, zövqə baxıb kefləndilər,
Bir pəriru tapdılar, ifritədən iyrəndilər.
Mən hələ onlardan artıq iş görüb ad almayım?!
Evdə bir ifritə vardır, bir pərizad almayım?!

Gəlmişəm təngə əlindən, bil ki, cana doymuşam,
Yarmışam başın, vurub qıç-qolların sındırmışam.
Bu yavuqlarda hələ bir qat gönündən soymuşam,
Əngini laxlatmışam, həm gözlərini oymuşam.
İndi bir siminbədən mən xanəbərbad almayım?!
Evdə bir ifritə vardır, bir pərizad almayım?!

Gün deyil, həftə deyil, bir ay deyil, bir il deyil,
Bir belə dərdə, qəmə dözmək məgər müşkül deyil?
Ömr azaldı, bel büküldü, Molla, bəs müşkül deyil?
Nazı-küsmək, söhbəti acı, dili bir dil deyil.
Dilbilən bir can alım, bir qəddi şümşad almayım?!
Ömrümün axır dəmində olmayım şad, almayım?!
Evdə bir ifritə vardır, bir pərizad almayım?!

*Məşədi Sijimqulu*



## SƏDİYƏ OXŞAR

Yek şəb təəmmüli-əyyami-güzəştə mikərdəm və məhərrəmlikdə xərclənən min-min və yüz və genə on yüz və yüz min manat pulların tələf olmağına təəssüf mixordəm və in əbyati-münasibi-hali-xud miqoftəm.

**Məsnəvi**

Hər dəm əz ömr mirəvəd nəfəsi,
Çon negəh mikonəm, nəmand bəsi.
Ey ki, min illər ilə dər xabi,
Məgər in pənc ruz dəryabi?*

Məgər bir də belə fürsət ələ düşər ki, durub baxırsan? Hı? Niyə dinmirsən? Deyirsən hökumətin pulu yoxdur?

Çox əcəb, nə qədər pul lazımdır? Bəli, bir neçə milyon, çox gözəl! Di indi gəl görək bu məhərrəmlikdə bütün İranda nə qədər pul məsrəf olundu?

Bilirəm sən nə deyəcəksən. Sən deyəcəksən ki, pəh, biz məgər rus millətiyik ki, Minin və Pojarski kimi vətən övladı çıxıb camaatdan bir günün içində lazım olan məbləği yığıb, məmləkəti təhlükədən qurtarsın? Məgər biz murdar əcnəbi millətlərdənik ki, vətən yolunda pul lazım olanda hər kəs əlindən gələni aparıb atsın vətən dəstmalına, ta ki, ixtiyarımız olsun ucadan şöyləməyə: «Biz də vətənimizi istəyirik!»

Bəd əz təəmmüli-in məni məsləhət an didəm ke,
Zəban boridə, be konci neşəstə sümm və bəküm**.

Və vaqeən hər nə danışsan, deyəcəklər ki, Molla Nəsrəddin dinə sataşır. Vladiqafqazda mollalar öz ciblərinin mənfəəti üçün lotu-potu ağsaqqal seçib göndərir ki, kasıb camaatı soyub mollalara pul yığsın (Naxçıvan yadıma düşdü). Bəli, biz bu əhvalatı jurnalımızda yazanda mollalar da camaatı öyrədirlər ki, «Molla Nəsrəddin dinə sataşır».

Zəban dər dəhan, ey xirədmənd çist?

Cavab: Lazım olanda dil ağızda bir kiliddir ki, camaatımızın eybini göstərmək vaxtı gələndə hünərimizin xəzinəsini kilidləyib bir söz danışmırıq ki, camaatı özümüzdən incitməyək. Amma lazım biləndə dilimizi ağızda bir açar hesab edirik və osmanlıdan gətirdiyimiz qafiyə və ləqəb xəzinəsini açıb, özümüzü meymunlara göstəririk ki, bizə «pəh, pəh!» söyləsinlər.

Xülaseyi-kəlam, məleikra pəndi-vəziri-naseh müvafiqi təb nəyaməd və buyurdu ki, Molla Nəsrəddinin boynunu vursunlar. Barı pulum da yoxdur ki, verəm «Məzhər» ruznaməsi əksimi sala qəzetəsinə barı gələcək üçün bir yadigar qala.

---

**Qitə**

Əz söhbəte-dusti berəncəm
Ke əxlaqi-bədəm hüsn nümayəd.
Eybəm hünəro kəmal binəd,
Xarəm güli-yasəmən nümayəd.
Ki düşməni-şuxçeşm, çalak,
Ta eybi-məra bemən nümayəd.

*Molla Nəsrəddin*

---

## MƏTBUAT

**"Həqiqət". "Kabusi-əzəm" məqaləsindən:**

Şikəmpərvər pişvalarımızın amalü təmənnalərinin iqtizasınca pənceyi-qəddaraneyi cəhalətdə candadeyi-səfalət olan növnihalani-vətənin bahari-fərəhfəzayi-şəbabətində ən rövnəqli vaxtının ədəmi elmü ədəbdən, nabüdi-fünunü maarifdən ədəbi qəmlər ağuşunda solğun, xəzanzədə, pozulmuş bir halda yaşamaqlarını hər bir insan günəşdən aşkar ehsas etməyi şübhəsizdir.

*Əli Abbas Müznib*

---

**"Molla Nəsrəddin"**

Vətən övladına tövsiyə edirik ki, türk ədəbiyyatına ən parlaq nümunə olan bu açıq və fəsih yazıları əzbərləsinlər ki, tezdən ədib olmaq yolunu öyrənələr.

Genə: Budur qəhrə-qəhrin içində bir ümidi-istiqbal, bir əməli-səadətnümun var isə o da ən nafe, ən faydalı mənafeyi-bəşəriyyədən mübhis?" risalələr, qəzetə, jurnallardan ibarətdir.

**"Molla Nəsrəddin"**

Xüsusilə bu kimi ən nafe, ən faydalı mənafeyi-bəşəriyyədən mübhis məqalələr.

Genə: Əcəba islam arasında mətbuatın ən rəzil, ən səfil, mütəzəlzəl bir halda böhrani-əzim içində sönməklərinə səbəb kimlərdir?

Həmin məqalədə öz dediyimiz kimi bir təntəneyi-xariqülədə ilə, bir iddayi-fövqəlxəyal ilə boyun çəkib bəlayi-ərşdən mütəkəbbiranə yazı yazan ədib və şairlər.

***

Genə: Dairəyi-təhliliyyeyi-islamiyan ən vase bir fəzayi-layətənahidir ki nə qədər məculat (məcunat) nə qədər icraati qeyri-təbii ixtira olunsa münhəl və məqbul olacağı vazeh mübrəhən və aşkardır.

*Əliabbas Münzib*

---

* Hər an ömürdən bir nəfəs gedir,
Baxıb görürəm ki, ömrüm çox qalmayıb.
Ey min illər yuxuda olan kəs,
Məgər bu beş günü yenidən tapa biləcəksən? *(Red. – T.K.)*

**Bu qədər bu haqda düşünəndən sora bunu məsləhət bildim ki, dilimi kəsib bir bucaqda lal-kar oturum. *(Red. - T.K.)*



Qubernator xanımı ilə müsəlmanları ziyarət edir.
Губернаторъ съ визитомъ у мусульманина.



Gəncədə.
Въ Елизаветтаполе.

– A kişi, Qubernator ki arvadı ilə gəlmişdi – bəs məni niyə onlara aparmırsan.
Жена: а меня почему не берешъ, когда онъ былъ у насъ съ женой.
– Sus yerində otur, mən səni aparsam müsəlmanlara xoş gəlməz.
– Боюсь, что это не понравится мусильманомъ.




Vətən uğrunda qanlarını əsirgəməyon nizamlı qoşunlar.
Иррегулярныя войска.

**Molla Nəsrəddin**

Buna nə şək! Hətta sizin bu kifsəmiş ibarələriniz, ürək bulandıran bu qeyri-təbii yazılarınız da münhəl və məqbul olacaq. Buna heç sözümüz yox. Lakin burasını bilə bilmirik ki, «Həqiqət» idarəsi yazı qıtlığınamı düşdü ki, bu cür qoxumuş yazıları camaatın burnuna soxub onları qəzetdən ikrah etdirir.

## MƏŞQ

Məhərrəmülhəramın birinci günündən etibarən ümumi müsəlman ordusunun böyük məşqinə cümlə düvəli-müəzzəmənin ataşa militari (voennı ataşe) hazır olduqları halda ayın onunda müvəffəqiyyətlə xitam buldu. Az-çox məcruh və məqtul yox deyildi. Elə ki, pişdar qolu (avanqard) ağköynəklərindən 31 məcruh, 2 məqtul, dəmdar qol (aryerqard), yəni zəncirzənlərdən 27 məcruh, 2 məqtul! Mərkəz, yəni (sentral) mərsiyəxanlardan 18 məcruh, sol cinah, yəni qıfılbəndlərdən 11, 3 məqtul! Sağ cinah, yəni sinəzənlərdən 47 məcruh. Cəmən yekun 114 məcruh, 6 məqtul!.. Məqtulların Əncümənin binagüzarlığı ilə üç nəfərini Kərbəlaya və üç nəfərini Məşhədi-müqəddəsə (nalojni platyoj) göndərilməsinə qərar verildi...

Məcruhlar isə:

14 nəfəri Müzəffəriyyə bimarxanasına?!.

20 nəfəri Novruziyyə bimarxanasına?!.

30 nəfəri Nasiriyyə bimarxanasına?!.

və 20 nəfəri Qibleyi-aləm bimarxanasında istirahətlərinə qərar verildi?!.

---

## RƏVAYƏT

Rəvayət neçə cürədir.

Aşura günü Məşqətə kəndində müsəlmanlar dəstə gəzdikləri vaxtda bir yəhudi adamlara baxıb gülübmüş. Bir rəvayətə görə məlun yəhudi haman saat it olub. Amma Kərbəlayı Məhərrəm and içir ki, yəhudi it kimi səs edirmiş.

Camaat haman gün bu möcüzün olmasına çıraqban ediblər və çox tüfəng və tapanca atdılar və hətta Kərbəlayı Məhərrəm özü əlli patron boşaltdı.

Bir rəvayət də budur ki, şəhərdə Parapet qarşısında dəllək olan Yefremdən rəvayət edirlər ki, məzkur Yefrem neçə gün bundan əqdəm paraxodla Bakıya gələrkən paraxodda neçə nəfər müsəlman da var imiş. Məqami-mübahisədə müsəlmanlar (jurnalların bərəkətindən) Allahı danmışlar. Bir neçə dəqiqədən sora bir bərk külək başlayıb paraxodu qərq edir, yəni Allaha şərik qərar verənlərin cəzasını verir. Erməni Yefremin bu rəvayətini hamı təsdiq eləyir, amma bir neçə təzə oxumuşlar başlayıblar ki, belə şey ola bilməz, odur ki, gözlərinə döndüyüm Bakı milyonçuları dəxi bundan sora dərsə gedənlərə bir çürük qəpik də verməyəcəklər və buna iki səbəb var.

Əvvəla, namərdlər xalqın pulu ilə oxuyub, adam olub axırda başlayıblar ki, «ay aman, qoymayın, kapitalistlər belə gəldi, kasıblar belə getdi, filan bəhməkan».

Və ikinci də budur ki, hər bir cavan ki, gedib dərs oxuyur, yəqin ki, bir də məhərrəmlikdə başını yarmayacaq. Yəni müsəlmançılıqdan kənar olacaq. Amma oxumasa və gedib Aşqabadda Ağa Seyid Məhəmmədin yanında bir-iki il təlim alsa, əsl müsəlman olub, gələr Bakını da işıqlandırar. And olsun ağanın kirli boynuna ki, belədir ki, belədir.

*Lağlağı*

---

## FÜRSƏT

Tiflis cəmiyyəti-xeyriyyəsi tərəfindən müsəlman qardaşlara xəbər verilir ki, cəmiyyəti-xeyriyyənin sədri İbrahim ağa Vəkilov cənabları bu yavuq vaxtlarda öz qulluğundan çıxmaq istəyir. Məlum olsun ki, İbrahim ağa beş ilin müddətində nə qədər zəhmətlər ilə cəmiyyət üçün beş-altı min manat cəm edib, amma burada qəflət edib ki, bu pulları banklarda saxlayıb, cibinə bir qəpik də qoymayıb. Xülasə, sözümüz oradadır ki, İbrahim ağa çıxandan sora onun yerinə bir özgə sədr seçmək lazım gələcək.

Bu elan ilə borclu bilirik ağaları xəbərdar edək ki, sədrliyi qəbul eləmək fikrində olanlar fürsəti itirməsinlər və piş əzvəqt özlərinə Şeytanbazarında dəstə tutub səs hazırlasınlar ki, seçkidə sədrliyə seçilsinlər.

Bir də belə fürsət ələ düşməz.

---

## TƏBRİZ XƏBƏRLƏRİ

1) Məhərrəm olduğuna görə Əncümən əzasından dörd nəfər rəbi əl-əvvəl ayının qürrəsinətək Əncümən üzvlüyündən istefa edirlər ki, bu iki ayı rövzə yerlərinə gedib pul qazanmaqdan qalmasınlar.

2) Ədliyyə bu günlər elan edib ki, şəhərdə hər nə bikar adam var, məzundur ki, gəlib səhərdən axşama kimi əllərini dizləri üstə qoyub ədliyyədə əyləşib aydan-aya məvacibi alsın, amma bu şərt ilə ki, gərək heç danışmasın. Bu elandan sora ədliyyənin əzası çox zorlanıb, az qalır bələdiyyədən də çox olsun. Buna görə bələdiyyə ədliyyənin bu hərəkətin xoşlamayıb şiddətlə öz əzasının məvaciblərin artırmaqdadır ki, camaat şövqə gəlib bələdiyyədə üzv olmağı ədliyyədən müqəddəm bilsinlər.

3) Təbrizdə şəbüstərli Hacı Seyid Hüseyn Ağa oğlunu bu il on beş yaşına yetişməyinə görə mədrəsədən çıxardıb Məkkeyi-müəzzəməyə ziyarətə göndərdi ki, öz sağlığında oğlunun hacı olmağını görüb dünyadan nigaran getməsin.

4) Bələdiyyə əzası fəqir-füqəranın halına çox fikirlər eləyib axırda buna rəy verdilər ki, qışı xırdaca qızlar və oğlanlar ki, küçələrdə qar-palçıq üstə əyləşib dilənirlər, gecələr tulanbarda isti küllərin içində yatsınlar ki, soyuq dəyib naxoş olmasınlar.

## LƏZGİ NİKAHI

Aşqabad camaatına məlum olsun ki, ləzgi əfəndiləri oxuduqları nikah dürüst deyil və hər bir kəsə vacibdir ki, bu qisim nikahları aparıb Hacı Seyid Məhəmməd ağaya təzədən oxutsun ki, şəriətə müvafiq olsun. Yoxsa xudanəkərdə bu nikahların bərəkətindən dəxi bir neçə vaxtdan sora Aşqabadda ağanın müqəddəs zürriyyətini çıxandan sora bir nəfər də halalzadə tapılmaz.

---

## ELAN

Qəzetə və jurnal satanları döymək üçün bura ağacları davam gətirmir. Naxçıvan mahalında Danabaş kəndinin kənkizçilərinə xəbər veririk ki, dəmiryol ilə Petrovsk şəhərinə nə qədər zoğal ağacı göndərə bilsələr, hər birini bir abbasıdan qəbul edə bilərik.

*Petrovskidə Mirmöhsün Dərbəndi və*
*Molla Qəvam Axund*

---

## MÜKAFAT

Bu sənə Nobel mükafatına nail olanların əksəri islam olmağına binaən qareini-girama bunların adlarını bildirməyi lazım görürəm.

| | |
|---|---|
| Yayıcı mollaları... | Rəzalətdə |
| Sipəhdari-əzəm... | Qeyrətdə |
| Sərdar Əsəd... | Şücaətdə |
| Eks qibleyi-aləm Məmdəli... | Səfalətdə |
| Seyid Əbdüləhəb xan həzrətləri... | Səxavətdə |
| Mizançı Baba Murad... | Həmaqətdə |
| Zaqafqaz seminariyasının elmi-ilahi müəllimi... | Dəyanətdə |
| Qaraqoyunlu Molla Nəsir bəy və iranlı Hacı Həkim... | Təbabətdə |
| Purişkeviç və ikinci Markov... | Ədalətdə |
| Niyazi və Ənvər bəylər... | Nəcabətdə |
| Səttar xan və Bağır xan həzrətləri... | Cəsarətdə |
| Qazan tatarları... | Kitabətdə |
| Acara müsəlmanları... | Xidmətdə |
| Şəki, Şirvan üləması... | Məğfirətdə |
| Erməni kirvələrimiz... | Ziraətdə |
| Ümum kürreyi-ərzdə mövcud islamlar... | Kəsalətdə |
| Üzdəniraq Amerika və yevropalılar... | Səadətdə |
| İnquş, Osetin, Kabardin qardaşlarımız... | Cinayətdə |
| Ordubad qırmızısaqqalları... | Təharətdə |

---

## GƏNCƏDƏN

### «Təzə professor»

Bilmirəm nədəndirsə «Mədəli» adlı adam çox bic olur. Bizim təzə ikinci bir Mədəlimiz var, köhnəpərəstlikdə şöhrət tapıbdır. Kişi hacı, ya qeyri əmidən o qədər təlim aldı ki, indi Hacı Seyid Bağır ağanı keçib olubdur professor. Mən indiyə kimi yaşamışam, müsəlmandan professor olduğunu eşitməmişəm. Əlhəmdülillah ki, hacı, ya qeyri əminin səy və qeyrətilə bir belə professor əmələ gəldi. Professorun həll etdiyi məsələlər:

1) Hər kəs qəzetə və məcmuə oxusa məndən qeyrətlidir – deyir.

2) Məktəbə gedən uşaqlar məndən hörmətlidir – deyir.

3) Gəncədən Tövfiq məktəbini öz xərcilə güşad etdirən Hacı Əli Hüseynov laməzhəbdir – deyir.

Maşallah belə Mədəliyə.

---

## «Ayrı xəbərlər»

Dostumuz Hacı Molla batıb, özünü ariflərə qatıb, insaf-vicdanını satıb, əqlü kamaldan çaşıb, müəlliməyə çatıb, torbada pişik balaladıb. «Miy! Miy!» səsi ilə qaralar ilə ağların içində çaxnaşma düşübdür.

*Kərbəlayı Keçəl*

---

*29 yanvar 1910*

**Molla Nəsrəddin idarəsinə:**

Cənab Molla əmi! Çox təvəqqe edirəm ki, tezliklə bir molla göndərəsiniz ki, Ağdaş qiraətxanasının lap axır nəfəsidir, can verir. Ona binaən molla onun mərhum olan kimi namazın qılsın. Çünki burada hərçənd namaz mollası var, ancaq ki, qiraətxana namazı qeyri namaz olduğuna görə bizim mollalar bacarmırlar. Qeyri əhvalat, çoxdur ancaq ki, vaxt yoxdur, sora yazaram.

*Müxlisiniz Qəlyanboğaz*

## ƏLMÖMİNUNƏ İXVƏTUN

Möminlər bir-birilə qardaşdırlar: həm bir Adəm övladı və həm də bir məzhəb və həm də eydi-Qədrdə əksəriyyət yekdigərilə qardaş olurlar.

Necə ki, bu gün Qədr bayramıdır, mən hər il bu vaxt Təbrizdə Səbil Əmir meydanında bir neçə adamla qardaş olurdum. Molla əmi, qulluğuna ərz eləyim ki, bağışlayasan, çünki sən Tiflisdə oturub gavur firənglərin bir-birinə əl verməl追ərindən başqa bir şey görmürsən, amma mənim burada otuz-qırx məsafədə ürəyim titrəyir və təcrübənin çoxluğundan Təbrizdə Səbil Əmirin həyatını, mədrəsənin hücəratını, su anbarını, məscid dalanını, balaxanələri, Qara Seyidin oturduğu qaranlıq mənzili, rəvaqı, rövzəni, xülasə, nə başını ağrıdım, bu günkü gündə nə qədər iyirmi yaşından az növxətlər və iyirmi beşdən çox cavanlar və yaşları qeyri məhdud qızlar və əyri qabırğa arvadların ayaqları toxunan yer varsa, hamısını görürəm. Molla əmi, elə bil ki, Molla Zeynalabdinin və Qara Seyidin və ciblərində bəyaz olan cavanların səsləri qulaqlarıma gəlir və deyirlər: Axvayətikə billahi və safahatikə vallahi və müştəhibikə tallahi və ma ərəfətü haza səmiyəhu vallahi!

*Başmağıyırtıq Xala*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***


Sünni
Şiə
Siz bizə baxmayın
Biz zahirən
məcburuq belə
məhəbbət etməyə,
məsciddə etdiyimiz
vəzlərdən siz əl
çəkməyiniz....
Siz bizə baxmayın
Biz zahirən
məcburuq belə
məhəbbət etməyə,
məsciddə etdiyimiz
vəzlərdən siz əl
çəkməyiniz....
Rotter

9 səfər 1328 **Beşimci il** 7 февраля 1910

# ملا نصرالدين

№6 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 6




Məşhur heyətşünas Sədüddövlənin rəyinə görə qorxuludur ki, quyruqlu ulduz yerlə toqquşa.
Астрономия допускаетъ, что комета можетъ столкнуться съ землей.

Litoq. S.Bıxova

## RƏHİM XANIN MƏHƏMMƏDƏLİYƏ ƏRZİ-HALI

Tacidarım, yanına gör necə şadan gəlirəm!
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!

---

Sən gedəndən bəri İranda çox andım da səni,
Fitnədə, zülmdə hətta belə dandım da səni,
Mindirə bilmədim öz təxtinə, yandım da, səni.
Mülki-İranə vurub atəşi-suzan gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!

---

Ərdəbili, Əhəri, Əgrəni viran elədim,
Dağıdıb cümlə dəhat əhlini talan elədim,
İki-üç min kişini qanına qəltan elədim,
Qılıcım qanlı, əlim qan ilə əlvan gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!



---

Yanına gəlmiş idi çoxlu tərəfdarların,
Molla qurbanəlilər, bir neçə həmkarların,
Şahsevən atlıları, firqeyi-biarların
Elədim cümləsini mən sənə qurban, gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!

---

İstədim bir də səni şah eləyim İranə,
Olmadı mümkün edəm məmləkəti viranə,
Qənim olsun çörəyin Yefremə, Bağır xanə,
Etdilər işləri hər yanda pərişan, gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!



---

Qaradağda sayılırdım iki qurdun biri mən!
Nə edim ki, elə hər yanda basıldım geri mən,
Qırılıb batdı qoşun, təkcə qutardım diri mən,
Dirilərtək demə, çün mürdeyi-bican gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!



Üstümə oldu hücumavər o məşrutəçilər,
Döndülər şirə qotur qəhvəçilər, kuzəçilər,
Etmədi tab müqabildəki məşruəçilər,
Xanlığım getdi, belim sındı, girizan gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm!

---

Vermədim mən yaxanı milləti-İran əlinə,
Bələdəm qonşuların çünki bu gün hər dilinə,
İltica eylədim axırda keçib rus elinə.
Ruhsuz bir bədənəm, valehü heyran gəlirəm,
Mat, məbhut, pərişan, peşiman gəlirəm,
Mal, dövlət götürüb xürrəmü xəndan gəlirəm.

*Məşədi Sijimqulu*

---

## NƏ VAXT?

Ölülər elə bilir ki, dirilər halva yeyir. Nemət Bəsir cənabları (həyə bu necə addı) elə bilir ki, Balaxanıdakı qız məktəbi qapandı. Amma qeyri-şəhərlərdə neçə-neçə qız məktəbləri var. İrəvanlılar Bakının Nicat cəmiyyətinə həsəd aparırlar ki, orada münəzzəm gecə kursları var. Həştərxanlıların məktəbi bağlananda indi yəqin deyiblər ki, «ax kaş biz tiflisli olaydıq ki, uşaqlarımız müfti və şeyxülislam işkollarında elm (ayıb olmasın) təhsil eləyəydilər. Şamaxılılar da indi öz yanlarında söz yox həmşəhərliləri olan Hacı Seyid Məhəmməd ağadan çox-çox narazıdırlar ki, onları atıb, gedib əyləşib Aşqabadda və çıraq öz dibinə işıq salmayan kimi, bu nainsaf hər nə ki, əlindən gəlir aşqabadlılara eləyir (və müzayiqə də ki, yoxdur: hava qaranlıq, su da lil, hər nə bilirsən elə, keçəlküçələ Allah bərəkət versin).

Xülasə, müxtəsər danışaq.

------

Nə vaxt oxuyaq və elm-fənn dalıyca gedək? Nə vaxt ticarət və sənətə məşğul olaq və nə vaxt əhl-əyalımızın istirahəti üçün pul qazanmağa fürsət tapaq.

Hələ bunlar qalsın kənarda.

Nə vaxt uşaqlarımız dərs oxusun.

------

Hamı bunu bilir ki, yay fəsli üç ay məktəblər bağlıdır. Yaydan sonra payız fəsli daxil olur, hava sərin, uşaqlar gəzib dinclərini alıb və həvəs ilə özlərini verirlər dərsə, birdən gözlərini açıb görürlər ki, paho! Orucluq gəldi. Bəli, nimeyi-şəbandan eydi-Fitrə kimi və hələ bir neçə gün də sora uşaqlar ibadətə məşğuldurlar (Allah-taala qəbul eləsin).

Ramazan gəldi keçdi, indi də rusların il axırı və rojdestvo bayramı gəlir. Bir tərəfdən də Qurban bayramı. Bunların hamısını bir-birinin üstünə qoyanda tamam ay yarım tətil eləyir.

Maşallah, hər yandan qazanırıq. Həmi öz bayramımız, həmi, xaçpərəstlərin bayramı.

Bəli, bunlar da keçdi. Sora məhərrəmlik gəlir. Dəxi bunu hamı bilir ki, zilhiccənin iyirmisindən «şaxsey» başlanır, ərbəində də ancaq müsəlmanlar ayılır. Aşura günü müqəddəslərimiz başlarını yarırlar, aşuradan da ərbəinə kimi gah ağlayırlar, gah da Aşqabadda Hacı Zeynalabdin Tağıyevin doqquz tay manufaktur malını oğurlayırlar. Axırda qaradovoylar gedib baş yaran müqəddəslərimizin evində qana batmış pak və təbərrük ağ köynəyin yanından oğurluq malı tapıb mübarək başların sahiblərini aparıb doldururlar rus həbsxanasına.

Bu da belə.

Sora da ki, təziyələr və ehsanlar başlanır. Bir az da keçir yay fəsli daxil olur və məktəblər bağlanır.

Məhərrəmlik Bakıdan «Nicat» cəmiyyətinin gecə dərslərinin yox olmağına bais oldu. Amma zarafat qalsın kənarda. Bu günlərdə Bakıda bir həkim peyda olub, naxoşları isti təndirə soxub sağaldır. Bir naxoş övrəti haman həkim soxmuşdu təndirə, amma övrəti buxar vurur, yıxılır odun üstünə. Övrət az qalmışdı ki, qovrulsun, kabab olsun, qonşular gəlib həkimin müalicəsini yarımçıq qoyub.

Bu da sənə həkim! Dəxi çox da özündən demə.

İndi «Nicat» cəmiyyətindən xahiş edirəm mənə cavab versin, görək kimdən ötrü istəyir kitablar çap edib dağıtsın? Və nə vaxt müsəlmanlar fürsət tapacaqlar ki, göz yaşlarını ətəkləri ilə silib, o kitabları oxusunlar?

Keçən il şeyxülislam məktəbinin uşaqları məhərrəmdə iki ay sinə vurublar, bu il də müfti şkolasının şagirdləri Qurban bayramını iki ay bayram saxladılar.

Allah cəmi mömin balaların imanını kamil eləsin!

Bəs nə vaxt işimizə məşğul olacağıq?

***Molla Nəsrəddin***

## ELAN

Bittili Şeyx Səlim Təbrizin hər məhəlləsində bir göyçək arvad axtarır ki, hərəsinin bir yaxşı evi və bir şeşdang kəndi və on min tümən nəqd pulu olsun. Hər kəsin sorağı olsa Əncüməndə bittili Şeyx Səlimə xəbər versin.

## MƏTBUAT

«Tənin»: İstanbulda «Nəşri-lisani-türki» cəmiyyəti təşkil edilərək başqa millətlərin arasında türk lisanını nəşr etməyə çalışacaqdır.

**Molla Nəsrəddin**

Yaxşı olar ki, cəmiyyət qabaqca öz adını türkcə yazmağa çalışa, sora özgələrə türki öyrədə.

------

«İqbal»: Fikrində təcəddüd və hürriyyət olmayan bir millətin üsuli-idarəsinin təcəddüdünə bel bağlamaq olmaz. İstibdadi-siyasidən əvvəl istibdadi-ruhani və mənəvini yıkmalı ki, o birinin tamamilə yakıldığına əmniyyət edilsin.




İyirminci əsrdə yer üzündə olan millətlərin halları.
Двадцатое столетие

**Molla Nəsrəddin**

Yəni nur ilə zülmət, od ilə barıt bir yerdə dura bilməyəcəyi kimi xürafat ilə həqiqət, cahilanə təəssüb ilə siyasi fikirlər bir yerdə dura bilməz.

Böylə, amma gəl görək bizim Quba meydanının filosof mühərrirləri nə deyirlər. Deyirlər ki, adamın başı Quba meydanının murdar zibil və müzürr qurdları ilə dolu olsa da olsun. Hünərin varsa o qoxumuş şurəzarə gül toxumu əkib bitirəsən. Daha özgə bir sözlə:

*Keçəl başa şirmahi darağ*

---

## TEATR

Bu gün Nuxadan gələn təzə xəbər bizi şad elədi: Belə ki, camaatın teatra olan rəğbəti günü-gündən artmağı səbəbindən camaat qərar qoydu ki, Dabbaxana məhəlləsində yüz min manatlıq bir teatr tiksin.

---

## BAŞ MƏSƏLƏSİ

Bu günlərdə Təbriz Əncümənində «baş» məsələsi müzakirə olunurdu. Axırda qərar qoyuldu ki, Əncümən üzvləri hər yanda alafranqa baş görsələr, fövrən dibindən qırxsınlar. Bir gündə üç yüz on yeddi baş qırxıldı. Avropa paytaxtlarına bu xüsusda teleqraflar çəkildi.

---

## İT

Rusiya şəhərlərində iki addımda bir «qaradavoy» var. Amma İstanbulda iki addımda bir qara «it» var. O da «qara»dır, bu da «qara»dır.

Amma təfavütü budur ki, o «davay»dır, amma bu «it»dir.

*İmza: Bihəya*

---

## PROTESTƏ PROTEST

«Molla Nəsrəddin» jurnalının dördüncü nömrəsində Qarabağ camaatı baş yarmaq və şəbih gətirməkliyinin ən əvvəl icadının nisbətin özlərinə verib, elədikləri fəxri və istədikləri imtiyazı yazıb oxucularına da tövsiyə buyurmusunuz ki, hər kəs bu barədə nə bilmirsə, yazıb onların protestinə cavab versin ki, məbada bu imtiyaz onların əllərinə düşə və müsəlman aləmin daha bundan böyük vəlvələyə salalar.

Ona görə mən əvvəla tarix və ikiminci hər cür dəlillər ilə qarabağlılara cavab verirəm ki, dəxi onlar çox mənəm-mənəm deməsinlər və bilsinlər ki:

Kar-hər boz nist xərmən kuftən
Gavi nər mibayədo mərde-kohən.

Belə ki, bu iddianı eləyib imtiyaz fikrinə düşənlərin gərək əllərində möhkəm sənədlər olsun, nəinki Qarabağ xanı İbrahim xan belə gəldi, Molla Pənah belə getdi. Əgər insafən bu yekəlikdə iddianı, bu böyüklükdə iftixarı dərbəndlilər və təbrizlilər eləsə, haqları var və heç bir kəs də onların qabağında danışa bilməz, çünki bu cür işlər padşah və vəzir işi deyil, bu iddianın qüvvədən fələ çıxmağına ümdətül-mühəqqiqin və zübdətül-müdəqqiqin mülazül-ənam və kəhfül-islam və mərcəül-alimin Fazil Dərbəndi tək vəhidül-əsr və fəridüd-dəhr bir müctəhidi-aləm lazımdır ki, səadəti-nasiriyyə, «Məcməül-büka» və «Əsrarüş-şühəda» kimi kitablar yazıb bu dəstgahları rəngi-rövğən ilə meydana çıxarda və behiştin açarları onun mübarək əlində olub hər kəsə öz əcrinə və ləyaqətinə görə feyz bağışlaya...

Vallahi, ravi and içir ki, o vaxtlarda ki, o vücudi-mübarək Təbrizdə Usta-Şagird məscidində zikri-müsibət eylərdi, nəinki məscid əhlindən, bəlkə bütün dağlardan, daşlardan da səda gələrdi ki: səddəqna və amənna, ey iblisi-dana və gövsaleyi-süxəngu və bir gün yuxudan durub buyurdu ki, bu gecə mənə aləmi-röyada vəhy yetişdi ki, aşura günündə gün dördüncü göyə yenib hərarəti göyləri yandırırdı və haman günün fasiləsi yetmiş iki saat olmuşdu. İş o məqama çatdı ki, Fizzə dağdan şiri köməyə çağırdı və səsləndi ki:

Ey şir, yetiş bu gün haraya.
İmdad elə ali-Mustafaya.
Lənət belə qövmi-bihəyaya.

Yoxsa zarafat deyil ki, bu il on beş mindən artıq ağsaqqal, qarasaqqal, lacivərdi saqqal, xəvanin, tüccar üzlərinə palçıq yaxıb, başlarına saman sovurub mələşə-mələşə şirin dalınca düşüb dolanırmışlar. Və şuşqulaq, çətribirçək naiblər və səhmnaklar əllərində qəddarə, o heyvani-bizəbanı dövrhadövr əhatə eləyib canfəşanlıq edirlərmiş və baş yara-yara dolanıb düz topxana meydanına gəlirmişlər (məxfi nəmanəd ki, bu hələ bir məhəllənin dəstəsi imiş) hansıların ki, dəstəbaşlarına min tümənlik şali-ümərayi-dövlət və millətdən xələt bağışlanıbdır. Bu şalları bazardan nisyə alıb bağışlayıblar, hələ indiyətək pulun da verməyiblər. Allahu ələm, verələr ya yox.

Vallahi riqqət mənə belə əl verir ki, az qalıram qələm əlimdə öz-özümə ağlayım və başımda tüklərim biz-biz olur.

Bu cəlalın qabağında söz yox, elə baş yararlar və o qədər adamı qan aparıb şəhid olar və şəbih çıxardarlar ki, qarabağlıların babası da min il bundan sonrayadək çıxarda bilməsinlər. Daha bundan artıq nə dəlil istəyirlər?!

Hərçənd sözüm çox uzun oldusa da yenə qurtarmadı, çox-çox dəlillərim ürəyimdə qaldı, amma yenə mən tələş edib hamı həmşəhrilərimiz ilə bərabər qoymayacağıq ki, bizim bu yolda çəkdiyimiz zəhmətlər və yardığımız başlar və gətirdiyimiz şəbihlər hədərə gedib qarabağlılar imtiyaz alsınlar. Hətta bu dəstgahları keçənlərdə Məhəmmədəli Mirzənin təkyəsində də gətirdirik. Hər kəsin də sözü var isə cavaba hazırıq.

*İmza: hamı o taylıların tərəfindən*
*vəkalətən bir nəfər O taylı*

---

## ZÜBDƏTÜT-TƏVARİX

---

Xərmən döymək hər keçinin işi leyil,
Bunun üçün nər öküz və köhnə kişi lazımdır.
*(Red. – T.K.)*

«Səda» qəzetəsindən:

Ürəfamızdan cənab hacıüş Şeyx Həsən Mollazadə Gəncəvi cənablarının (heyf ki, adı çox qısa olub) təlif etdiyi «Zübdətüt-təvarix» ünvanlı əsərinin 2-ci cildi mövqeyi-intişarə qoyuldu.

Müəllif cənabları bu «müfid və nafe» əsərilə (necə ki, birincisidir) aləmi-islama böyük bir xidmət göstərmişdir.

**Molla Nəsrəddin:**

Şəkk yox ki, əgər böylə arif şeyxlərimizin «müfid və nafe» əsərləri olmasaydı, aləmi-islamın başı böylə göyə qalxmazdı. Allah, əlbəttə, yaratdığı dünyanı Mehdi əvəzinə, arif şeyxlərdən xali qoymaz.

Biz də tövsiyə edirik ki, müsəlmanlar fürsəti fövtə verməyib həmin əsərləri alıb oxusunlar. Oxuyanları şövqə gətirmək üçün birinci cildin 20-ci səhifəsindəki bu «müfid və nafe» mətləbi zikr edirik:

«Bir gün Süleyman peyğəmbər günorta zamanı əyləşərkən bir neçə atlar yel kimi gəlib su içib qayıtdılar. Peyğəmbər cin tayfasını çağırıb dedi: İstəyirəm o atları hazır edəsiniz. Cinlər hiylə edib bir neçə at tutub gətirdilər. Süleyman peyğəmbər atlara məşğul olub qəflət elədi və əsr namazı fövt olub ağladı. Və dünyadakı nəcib atlar haman atların nəslidir...»

------

Müsəlman qardaşlar arxayın olsunlar ki, əsərlər başdan-başa buna oxşayan mürid və nafe bəhslərlə doludur.

---

## NİCATÇILARIMIZ

İrandan, hətta Nəcəfi-Əşrəfin özündən Tiflisə gələn bir çox tanışlar bizə xəbər verirdilər ki, Nəcəfdə ən böyük üləmanın iştirakı ilə «Heyəti-elmiyyeyi-Nəcəfi-Əşrəf» adında bir cəmiyyət meydana gəlib İranın məşrutəsini möhkəmləndirir və İrana nicat verilsə, məhz bunların əllərilə veriləcəkdir.

Doğrusu, Nəcəf darülfünunlarından yetişən diplomatların İrana nicat verə biləcəklərində bir az şəkkli idim. Şükürlər olsun ki, Təbrizdə çıxan «İstiqlal» qəzetinin 34-cü nömrəsində həmin «Heyəti-elmiyyeyi-Nəcəfi-Əşrəf»in ümum müsəlmanlara xitabən yazdıqları nicatnaməni oxuyub şəkkdən çıxdım.

Mən də yoldaşlarımı şəkkdən çıxarmaq üçün nicatnamədə ən ziyadə əhəmiyyət verilən yerləri eynən burada yazıram ki, oxuyub nicat yollarını öyrənsinlər:

«Bayəd əxtar şəvəd an ke canfəşaniyi-mücahidini-islam (əcəb, kimləri deyirlər?) nə bəraye an bud ke, lisani-farsi əz ərəbi təmyiz yabəd» və alati-ləhvü ləəbra (musiqi elmini) və əcnasra ələnən be latar (latareya-piyanko) güzarde və elan dər cəraid kərdəd.

***

Doğrudur, məşrutiyyət uğrunda canlarını fəşan edib Tehranı Məhəmmədəlidən zəbt edən mollalar ondan ötrü maldan-candan keçmədilər ki, dinsiz ariflər, qəzetçilər zəhmətsiz və müftəcə gəlib mətbuat meydanını əllərinə keçirsinlər və həyasızca yazsınlar ki, xoruz səsi eşitməyən çətin ərəb sözlərini farsidən çıxaraq və elə yazaq ki, savadlıların çoxu başa düşsün. Hə, bu bic qəzetəçilər də istəyirlər ki, ərəb sözlərini farsidən çıxarıb ağaların hünərlərinin üstlərini açsınlar və bazarlarına kasad buraxsınlar.

«Heyəti-elmiyyeyi-Nəcəfi-Əşrəf» yenə yazır:

«Yaliləcəb (pəh, pəh) ke cərayede-məsləke-sabiq («?») xodra əz dəst nə dadə əz təklife-xod təcavüz nəmudənd.

Gahi lisani-tən bər əşraf və fəryad ke çera niyaqani-mara koştənd, səlatine-mara zəlil, xəzaine-mara tarac və lisane-mara müşəvvəb be əlfaze-ərəbi və çenin və çenan kərdənd və təhsin əz birun amədən zənani mükəşşəfatül vücuh dər küçe və bazar və qeyre zalik nəmudənd...»

***

Doğrudan, çox təəccüb ki, indiki İran qəzetələri, Müzəffərəddin şahın vaxtında çıxan «Müzəffəri», «İran» qəzetləri kimi, camaatı azıdıb başdan çıxarırlar. Pəh, pəh! Qanacağa, elmə qurban!

Budur bizə nicat verəcək siyasilərin, rəhbərlərin məmləkət tədbirləri. Budur vətənimizin vücuduna hər tərəfdən batan qanlı pəncələrdən bizi xilas edəcək vasitələr.

Budur bu gün İranın ən ziyadə möhtac olduğu «pul və qoşun» dərdinin əlacları.

Budur çoxumuzun ümid və nicat gözlədiyimiz rəhbərlərin qafalarındakı.... hikmət və fəlsəfələr.

*Lağlağı*

---

## POÇTA QUTUSU

Bakıda Ağa Cəfər Quliyaniyə: Abunənizin nömrəsini nişan verməməyinizə görə yazdıqlarınıza etina edə bilmədik.

Şamaxıda «Cinbaş»a: Adsız kağızları heç oxumuruq da.

------

Ağdamda «Dost»a: Təqlid məsələsini və görülməmiş bayramı lazım bilmədik çap edək.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***



– Yekə kişi, sənin ki, bir belə xəyalın var idi, niyə gündüzdən demirdin çıxaq qabağına.



– Ax, bu köpək oğlunun itləri məni biabır edəcəklər.



Siğə etdiyi övrəti ziyarətə gedir.

16 səfər 1328 Beşimci il 14 февраля 1910 г.

ملا نصرالدین

№7 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 7

Rəhim xanın Rusiyaya səfəri



Hər kəs ki, istəyir hörmət və şöhrət qazansın,
mənim tək öz əliylə min baş kəssin.

Litoq. S.Bıxova

## «Həqiqət», nömrə 26

### NƏZİRƏ

Mənim ey naxçıvanlı şairə heyran olan könlüm,
Yazan latailatə matü sərgərdan olan könlüm.

---

Həya qılma, açıq söylə, cahanda sən görübsənmi
Həmi şair, həmi molla, həmi şeytan olan, könlüm?

---

O cür şair çıxar minbərdə hər il xəlqi süng eylər,
Genə şərm eyləməz, söylər, mənim giryan olan könlüm.

---

Rəvadır gər desə: ey tutmayan bir məsləki-qaim
Olub aludə dünya malına xulğan olan könlüm.

---

Münəzzəh adəmiyyətdən, mübərra hüsni-sirətdən,
Kəlami ləğv, qövlü hərzəvü hədyan olan könlüm.

---

Danosbazlıqda, xəlqi tovlayıb hər şəklə düşməkdə,
Təqəllübdə, qərəzdə heyrətə şayan olan könlüm.

---

Orucluqda, məhərrəmdə salan xəz xirqə duşinə,
O aylardan sora hərrac edib üryan olan könlüm.

---

Danan «Tazə həyat»ın, «İttifaq»ın pulların sovsem,
Yazıq «Zənbur»un üstə arizi-divan olan könlüm.

---

Əgər ölsən də, söz yox kim, «O taylı» səndən əl çəkməz,
Yazar, tənqid edər hər felini insan olan könlüm.

---







## HƏNA

Əlbəttə, dünya və aləm dağılacaq və quyruqlu ulduz bir günləri genə toqquşub məxluqatı puç edəcək.

A qardaşlar, siz Allah, bir qulaq verin, görün doğru deyirəm, ya yox.

Hənanı ki, Allaha şükür, eşidibsiniz, bilirsiniz ki, necə müqəddəs bir şeydir, müsəlmançılığın şərtlərindəndir və fəziləti nə qədərdir. Həzrəti-Sadiq əleyhissəlam fərmud ki, hər kəs əz sər ta pa həna bemaləd, fəqiri və pərişani əz u bər tərəf şəvəd. Hər kəs bu sözlərə inanmayır, açsın «Hülyətül-müttəqin» kitabını və on birinci fəsli oxusun və görsün ki, həna tərifində imamlardan və peyğəmbərlərdən nə qədər hədislər nəql olunub.

Bunların hamısını görə-görə və bilə-bilə Bakının eşşəkçiləri və ovçuları gör nə qayırırlar. Bu məlunlar hənanı alıb öz saqqallarına yaxmaqdan, yaxırlar eşşəklərin yalına və quyruğuna və itlərin başına və bu səbəbdən Bakıda həna bu dərəcədə bahalanıb ki, kasıb müsəlmanlar dəxi alıb öz müqəddəs saqqallarına yaxa bilmirlər. Və sifətdən düşüb yəhudi və erməni qocalarına oxşayırlar.

Əlbəttə, dəxi bundan sora xeyir və bərəkət götürüləcək. A kişi, belə də bihəyalıq olar? Həna ilə zarafat olar?

---

## NƏCASƏT

Axtılı Hacı Əbdürrəhman əfəndi «Əsasüddin vəliman» adında bir kitab yazıb, «Səda»nın «Bir nəfər»i bu kitabı açıb görsün ki, bu fazil iqtisad və siyasət məsələlərini necə şərh etmiş. Və kitabı açan kimi «Bir nəfər»in gözünə «Babül-hədis və fəslün fi adabil-xəla və babülqüsl və babül heyz» sözləri sataşıb. Biçarə utandığından kitabı büküb qoyub kənara.

------

Hacı Əbdürrəhman əfəndi kimdir?

Heç bir kəs! Bir naməlum molla.

Amma Fazili-Məclisi kimdir?

Neçə milyon məşədi və hacıların Allahı. Və mən həmişə Fazili-Məclisinin kitabını açan kimi «adabi-cima» səhifələrini görən kimi xəcalət çəkib, xəlvətcə kitabı gizlətmişəm ki, həyalı adamların gözünə sataşmasın.

Bu, Fazili-Məclisi.

---

Dəxi kimdir neçə milyon uzunqulaqların Allahı? Hacı Mirzə Məhəmmədhəsən Şirazi. Ağanın «Məcməül-məsail» kitabını insan oxuyub utanmasa, əlbəttə, bihəyadır.

------

Odur ki, mənim qoca anam küçəyə çıxıb qonşu evinə getmək istəyəndə mən həmişə yalvarıram ki, «ay ana, sən Allah, elə bir yol ilə get ki, rastına müsəlman kişisi, ya müsəlman uşağı çıxmasın. Çünki Fazili-Məclisi və *Məhəmmədhəsən Şirazinin kitabları camaatımızı biabır* eləyib və bu ağaların bərəkətindəndir ki, mən dünyada müsəlmanlardan biədəb millət yer üzündə nişan verə bilmirəm.

------

Budur «babün-nəcasət». Vilayətimiz, küçələrimiz, həyatımız və uşaqlarımız «babün-nəcasət» ilə nəcisləniblər.

Və çünki pak edən şeylərin biri də oddur, bu yuxarıda ad verdiyimiz vərəqləri yandırmasaq, nəcisi rədd edə bilməyəcəyik. Çarəsi oddur.

Bəli, mətləbdən uzaq düşdük. Petrovskidə Molla Qivam axundu şəhərdən qovalamaqdan söz düşmüşdü. Bəli, zəmani ki, bu zəhrimar qəzetə və jurnallar başladı yer üzünə dağılmağa, Allah-taaladan Nuh peyğəmbərə vəhy oldu ki, gəmisini hazır eləsin və tək bircə Məşədi Əbdülbaqi Ələkbərovdan savayı cəmi mömin bəndələri götürsün gəmiyə. Səbəbi də bu idi ki, Allahın yolundan çıxan Məşədi Əbdülbaqi razı olmamışdı ki, dörd yüz on manat verilsin boynu yoğun Molla Qivama...

Xülasə, ravi belə rəvayət edir ki... (Mabədi var.)

*Molla Nəsrəddin*

---

## ƏMİR

Qovvətəm badə, qovvətəm yarəst,
Xanra in do əmr dər karəst.
Eyşe-xan mişəvəd be əmrude-xub,
Əmrud-xub nist, mordarəst.
Ey ke, quyi məbin surəte-xub,
Qeymәte in soxən do dinarəst.
Bəççehaye-təmame-Torkestan
Nəzde-mən hazerəsto təyyarəst.
Nə şenid gər əmiri söhbəte-yar,
Çe əmirəst, mərde-bikarəst.
Dəst əz mən bedar, ey Molla
Ke məra paye-dil gereftarəst.
Pişe mən badə bər bərəm sadə
Dərde-mən, ey fəqir, besyarəst.
Bər məne-məst çənd tənə zəni
Molla Nəsrəddin, in çe azarəst?
Məsləkət eyne-mərdom azarəst.
Zin qəzet comleye xəlq bizarəst.
Mən neyəm Məmdəli, nə usta Həmid,
Hər do inşan həpənde biarəst.
Mən Əhəd xan əmire-tenraləm,
Ləşkərəm bəççeha xalidarəst
Əzrəvanivo təbe Xortdan bəy
Mostəbidan təmam zenharəst.

## KƏNDLİLƏRİN MƏİŞƏTİNDƏN
### (51-ci nömrədən mabəd)

Rəhmətlik babam «Sarımsaqlı» kəndindən söhbət açıb nəql eylərdi ki, bir əlli on bir il bundan irəli bizim bu kənd bir yaxşı abad kənd idi. Və yaxşı keçmiş və gələcəyi bilən öz camaatının və övladlarının gələcək dərdlərini çəkən kişilər var idi. Səxavətli, mərhəmətli, istiqanlı, rəhmdil və dünya malına bənd olmayan adamlar idilər. Günlərin bir günü kəndimizə bir molla gəlib çıxdı, özü

də İran əhli və mərsiyəxan idi, məhərrəmlikdə bizə mərsiyəxanlıq eləməyə gəlmişdi. Kəndimizin ağsaqqallarından biri bu mollanı evinə qonaq apardı. O günü və o gecəni mollaya yaxşı hörmət, ikram, plov, çay, ılıq yumurta, filan qonaqlıq elədi və gecə də nümunədən ötrü... bir az mərsiyə oxudu. Bəyəndik, gecə orada yatdı, elə ki, sabah oldu, biçarə ev sahibi baxdı gördü ki, cibində altmış manat pul yoxdur. Yazıq kişi başladı pulları gəzməyə. Nə qədər bu yana, o yana axtardısa da, pullar tapılmadı. Dəxi güman eləmirdi ki, nəuzübillah molla oğurluq elər.

Bəli, pul tapılmadı, amma bu tərəfdən molla əl-ayağa düşüb bir rahi-giriz gəzirdi ki, qaçıb pulları bir yana çıxarda bilsin. Xülasə bir hiylə ilə evdən əkilir... Babam sözünü bu məqama yetirəndə mən hirsli-hirsli baxdım babamın üzünə və dedim: Baba! Bu necə sözdür, sən utanmayıb, mollanın haqqında deyirsən? Məgər sən müsəlman deyilsən? Nəuzübillah, mollanın da eybini açıb qeybətini eləmək olar? Səni müsəlmançılıqdan çıxardarlar! Bu nə böhtandır? Rəhmətlik kişi gülümsünüb dedi: – Oğul, sarsaqlama, mən yalan danışmaram, hərgah sözümə inanmırsan, bir get Gəncə şəhərinə, gör bir molla qazilikdən ötrü neçə yüz manat rüşvət verir. Bircə gör ki, xalqın əqlini oğurlamaqdan ötrü (hərçənd ki, ağıl yoxdur) bir molla toy məclisində özü otura-otura «toyda nə üçün tar, qaval və xanəndə var?» – deyib bir hacını təhqir edir və toy sahibi ilə əl-ələ qalxır və və və qalan söhbəti gələn həftə.

(Mabədi yoxdur.)

*Məşədi Sijimqulu*

---

## QATMAQARIŞIQ

Bilmirəm, söhbəti haradan başlayım. Deyirlər ki, Gədəbəy mədənində Şeyx Cəlil adında bir mərsiyəxan dünyada bir biclik qalmayıb ki, biçarə həmşəhrilərin başına gətirməmiş olsun. Bilmirəm nədənsə yaxşı mollalar yadıma düşəndə həmişə İrəvan qazisi Molla Məhəmmədbağır ağa yadıma düşür. Bir gün var idi, bir gün yox idi, bəli, məscid mövqufatını vəqf edənlərin varisləri ilə dilbir olmaq və rüşvət alıb vəsiyyətnamələri gizlədib müddətini fövtə vermək ki, dəxi işə keçməsinlər, xülasə, məscidə girib oğurluq eləmək, nə eybi var, bunlar ötüşər, ancaq bu dinsiz Molla Nəsrəddin hələ bilmirəm niyə bizim qazimizə sataşır.

------

Məzə orasındadır ki, qazi cənabları bu işləri görəndən sora genə təşəxxüs ilə müsəlman camaatının içindən keçib gedəndə halına bircə zərrəcə də təğyir vermir. Çünki bilir ki, İrəvanda hər nə eləsən keçib gedər. Amma gündə bir gəlib dostlarından soruşur ki, «görəsən məni «padsud» verməzlər ki?»

Yəni kaş məndən hökumət məscidin zərərini almasın. Ondan sora dəxi mən heç bir şeydən qorxmuram.

------

Bu İrəvan, o da Gədəbəy. Gədəbəydə genə bircə nəfər tapıldı ki, Şeyx Cəlildən Molla Nəsrəddinə şikayət yazdı. Amma irəvanlılar üçün təfavütü yoxdur. Gədəbəy dedim, bir əhvalat yadıma düşdü: Məhərrəmlikdə burada təziyə məclisində Hacı Əsədbaladan küsüb, qoyub gedib evinə. Sora camaat növhə deyə-deyə və sinə vura-vura hacını yalvarıb-yaxarıb genə gətiriblər məscidə. Qərəz, Allah rast saldı ki, hacı genə təşrif gətirdi. Yoxsa yazıq gədəbəylilərin yası ikiqat olacaq idi. Necə ki, Təbrizdə bu il iki aşura olub: biri məhərrəmin onunda, biri də on səkkizində, yəni Molla Nəsrəddinin nömrəsi Təbrizə çatanda, çünki haman nömrədə Əncümənin Bittili sədrinə və üzvlərinə sataşmışdıq.

Allah axırını xeyir eləsin.

*«Dəli»*

---

## ÇARƏ

Çarə, çarə, çarə, aman günüdür bir çarə, İranın pulsuzluğuna bir çarə.

Cavab:

Qadanı alım, niyə ürəyini sıxırsan ki? Bu nə bir çətin şeydir ki? İranda hər nə qədər dəmir mədəni var, tez işə salıb işləsinlər ki, məhərrəmlikdə zəncirvuranların zəncir dəmiri xaricdən gəlməsin və Həştərxanda Müzəffəriyyə məktəbində uşaqlara zəncir vurmaq təlimini verəndə rusların murdar zəncirini almağa məcbur olmasınlar.

------

Çarə, çarə, çarə, aman günüdür bir çarə, mən nə edim ki, məsciddə ya Əncüməndə nitq söyləyəndə sözümün təsiri olsun?

Aman günüdür mənə bir çarə.

Cavab:

Başına dönüm, heç darıxma, bundan asan bir iş yoxdur. Lazımdır ki, tumanbağın elə uzun olsun ki, Təbrizdə Şeyx Səlim kimi Əncümənə ya məscidə daxil olanda tumanbağın səndən qabaq atılıb düşsün.

O vədə sən olarsan məşhur vaiz.

------

Çarə, çarə, a molla əmi, aman günüdür mənə bir çarə. İstəyirəm Bakıda məni şəhər idarəsinə üzv seçsinlər, nə çarə edim ki, mən də seçilim? Aman günüdür mənə bir çarə.

Cavab:

O gözlərinə Molla əmi qurban olsun, niyə qüssə eləyirsən, bundan asan ki, bir iş yoxdur.

Bunun çarəsi budur ki, cibində pulun olsun, lakin peysərinin gönü nə qədər qalın olur olsun, genə səni seçəcəklər.

------

Çarə, çarə, çarə, ay Molla əmi, bemən çarə, bemən çarə. Ax, dad, fəryad, mən nə çarə edim ki, Tehranda nayibüssəltənə olum?

Aman günüdür, a Molla dayı, mənə bir çarə.

Cavab:

Əzizim, nahaq yerə təşviş edirsən, mən sənə bir yol göstərim, əgər fayda verməsə «Aşqabad müqəddəsləri»nin vəbalı İrəvan müqəddəslərinin boynuna olsun.

Bunun çarəsi budur ki, əcnəbi səfarətxanalarına bir şipyonluq yolu aç və biçarə vətənin sirlərini apar ver düşmənlərə.

Bundan yaxşı vasitə mən tapa bilmərəm.

(Mabədi var.)

*Hərdəmxəyal*

---

## KEÇƏN İLİN ATÇOTU

1) Keçən il, əlhəmdülillah, Qafqaz həbsxanaları vücudi-möhtərəmlər ilə ləbaləb dolub xarici millət üçün heç bir azadə vakansiya qalmadı.

2) Camaati-müslimin, himmət babətindən olaraq, qətnamə ilə hər kənddən 2-3 nəfər yetimləri naxır və buzov akademiyalarına göndərib, axırda onlara hər biri bir çanaq toyuq dəni hədiyyə elədilər.

3) Diş, baş, göz və qeyri ağrıların dəfi üçün yaş yetirmiş və dünya görmüş qoca ağaclara əvvəl-axır 352748 cırıq-cındır bağlandı.

4) Yanvarın ibtidasından 31 dekabra kimi hər həftə cümə günləri 7516 nəfər ana-bacılarımız hər biri bir badya aş ilə millətimizin ehyasına çalışan mücahid məhbuslarımızı ziyarət etməyə təşrif buyururdular.

5) Möhtərəmə analarımızın övladlarına verdikləri tərbiyədən dolayı 17393 nəfər məsum uşaqların burnunda çöp qalıb, bu cümlədən 8314 uşağın çöpü üfürülüb qalanlarınınkı tək səbir gəldiyindən gələsi ilə qaldı.

6) Gələcəkdə fəxr edəcəyimiz millət balalarının mühafizəsi üçün 24593 bədnəzər duası yazılıb, onların çiyinlərinə dəxi 36649 ədəd itmuncuğu tikildi.

7) Cənab cindarlarımız xəstələrin şəfası üçün 61351 sürxbad oxuyub, 319 arşın göy qədək yandırıb, 9327 çardaqda başı-ayağı bağlı qarğı-qamış həbs ediblər və bunlardan əlavə 465 ədəd qara qoçun ətini yeyib gəmiklərini dəfn ediblər və

8) Mərhumani-millətin günahlarının məğfirəti üçün təziyələr də biri bir abbasıdan bisavad adamlar tərəfindən 123 ədəd saxta və səhv cüz oxunub, 3528 yerdə möhtərəm mollalarımız boğça-boğça oynadılar.

*Sofi Zənbil*

---

## BAİS

Bais, evin dağılsın!

Əlbəttə ki, dünyada pislik yerdə qalmaz, əlbəttə, zalımlar cəzalarını çəkəcəklər. Uşaqlıqda qonşumuz Fatma xaladan bir belə qarğış hər gün eşidirdim, deyərdi ki: «bais, evin dağılsın!».

Nuxu naçalniki Məhəmməd ağanın evi, yəqin ki, bir gündə dağılacaq. A qardaş, naçalniksən, başını sal aşağa, qeyri naçalniklər kimi səhər dur get divanxanaya, kağızlara qol çək, saat birdə çıxart saatı bax və şaşkanı bucaqdan götür, partupesini keçirt çiyinlərinin altına, çıx, qoy get evinə.

Yoxsa bu nədir başlamısan ki, «mən gərək oğruları və quldurları çörəkdən salam». Vallah, baiskarlıq yaxşı şey deyil, vallah, Fatma xalanın qarğışından qorx və bu işləri səhl sayma. Bu qədər sənin barəndə verilən danoslar, bu qədər şipyonluqlar hamısı öz tutduğun əməllərin nəticəsidir.

Yoxsa bu işlər zarafat deyil, hər birinin bir səbəbi var. Və bir də bunu nəzərə al ki, sən müsəlman içinə düşmüsən, gərək öz baxtından küsəsən.

*Cırcırama*

---

## POÇTA QUTUSU

Bakıda «Bikar»a: Əgər bikarsan, get mərsiyəxan ol, yoxsa bu cür məşğələlərdən sənə bir mənfəət ola bilməz.

------

İrəvanda «Bir şagird»ə: «Fatma xalanın Qulaməliyə məsləhəti» adında şerləriniz pis deyil, amma buna oxşar çox yazılıb. Özgə mətləbləri bu sayaqda yazsanız, bir növ düzəldib çap edərik.

------

Gəncədə «Mehman»a: Dəxi, bundan sonra Xasayurt qırmızısaqqallarından savayı özgələrin adını çəkməyəcəyik.

------

Gəncədə «Müəllim»ə: Yazıların səni müəllimə oxşatmır, çap oluna bilməz.

------

Aşqabadda «Bəxtəvər»ə: Çap olunmayan məqalələri geri göndərə bilmərik. Yeddi qəpiklik markanızı istəsəniz, gərək gəlib idarəmizdən aparasınız.

## ELAN

Məlum şeydir ki, Qafqazda yüz on səkkiz müsəlman kəndi var və dörd min müsəlman şəhəri var. Bu kəndlərin, şəhərlərin hər birisində müsəlmanlar başlayıblar məscid tikməyə və xərcini Bakı dövlətlilərindən istəyirlər.

Bu cəhətdən Bakı milyonçuları cəmi aclara və kasıb tələbələrə elan edirlər ki, dəxi bundan sora heç bir möhtaca bir qəpik pul verilməyəcək; istər ac ola, istər bir manatdan ötrü bütün dərslərindən qala. Ondan ötrü ki, bundan sora hər nə qədər ianə lazım olsa, cəmisi məscidlərə veriləcəkdir.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

Выбор в гласные.




Cibimdə bir qəpik yox, dəxi mən nə tövr seçilərdim?!
Bakıda şəhər idarəsi üzvlərinin təzə seçkisi.



İkinci pərdə.
Второе действие.



Əvvəlinci pərdə.
Первое действие.

ملا نصر الدين

№8 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 8




Litoq. S.Bıxova

## TƏŞƏKKÜR

Mollalar, taleyimiz oldu əcəb yar bu gün,
Misyonerlər də bizə çıxdı havadar bu gün.

---

O ki, məktəbləri məhv etmək idi niyyətimiz,
Yox idi əldə və lakin ona bir qüdrətimiz,
Məktəb artdıqca azalmaqda idi hörmətimiz,
O açıldıqca qapanmaqda idi sənətimiz,
Günbəgün zaid olurdu qəmimiz, möhnətimiz,
Arkadaşlar, sevinin, oldu rəva hacətimiz,
Qəmimiz bitdi, fərəh oldu nümudar bu gün,
Misyonerlər də bizə çıxdı havadar bu gün.

---

Misyonerlər, o gözəl fikrli ərbabi-düha
Sank-Peterburqda etmişlər əcəb bir şura.
Ki müsəlmanlar açan bunca məkatib nə rəva
Oxudub həndəsə, təlim edələr coğrafiya,
Hikmətü heyətü tarix ilə elmi-əşya,
Bu işə bizdə təhəmmül ola bilməz əsla.
Çalışın himmət edək dəfinə zinhar bu gün,
Misyonerlər də bizə çıxdı havadar bu gün.

---

Misyonerlər bu gözəl əmrə edirkən iqdam,
Biz neçün lal oturub eyləməyək bəhsə davam?!
Xassə bu elmlərin biz üləmayi-islam
Etmişik bir kərə təhsilini islama haram.
Bunları bilməz ikən biz, niyə övladi-avam
Oxuyub, adam olub, eyləsin ağazi-kəlam.
Şimdi fürsət var ikən görməli bir kar bu gün
Misyonerlər də bizə çıxdı havadar bu gün.

---

Misyonerlər, görüm Allah sizə ehsan eləsin!
Biz kimi sizləri də daxili-iman eləsin!
Qoymadız çünki müsəlmanları tüğyan eləsin,
Yeni məktəbləri Allah özü viran eləsin!
Uçurub dam-daşını xak ilə yeksan eləsin!
İndi qoy məktəb açanlar gedib əfğan eləsin!
Qalsın hər yerdə müəllimləri bikar bu gün!
Misyonerlər də bizə çıxdı havadar bu gün.

......



## PEŞİMANÇILIQ

Əhvalat bu qərar ilədir ki, Dağıstanda bir kənd var, adı Xocalmaxıdır. Burada bir neçə köhnə məscid var, amma çünki bu məscidlərin divarları yox idi, mümkün olmurdu məscidi bağlı saxlamaq ki, gecələr içinə heyvan dolmasın necə ki, cəmi müsəlman kəndlərinin məscidləri.

Bir gün xocalmaxılılar eşidirlər ki, Bakıda bir günün içində Peterburq məscidinə yüz otuz manat pul yığılıb. (Bakıda otuz min manat imiş, amma oraya gedib çatınca bu qədər olub, xülasə.)

Bu xəbər kəndə gələn kimi xocalmaxılılar Hacıya tel vurublar ki, «biz də məscid tikirik». Hacı həmin gün götürüb bunlara iki yüz manat göndərib. Kəndlilər gördülər ki, onlar xəyal edən olmadı, yüz otuz min manat hara, iki yüz manat hara. Bunun çarəsi? Çarəsi budur ki, Hacının iki yüz manatını qaytaraq özünə və yazıq ki, biz Hacıdan küsmüşük və yüz otuz min manat gəlməyincə barışmayacağıq.

Bu barədə kəndlilər başlayırlar qeylüqal eləməyə. O deyir pulu qaytaraq özünə, bu deyir – Hacı yazıqdır, qəlbinə dəyməyin. Bəli, axırda qət olunur ki, pulları geri göndərsinlər və polkovnik Haşımbəyov da qətnaməyə qol qoyur.

Pulu geri göndərəndən sora kəndlilər və Haşımbəyov gözləyirlər ki, bəli, pul və kağız Bakıya çatan kimi Hacı fabrikanı və imarətlərini zaloqa qoymalı olsa, haman gün xocalmaxılılara yüz otuz min manat göndərəcək.

Bu heyndə şirin yuxudan ayıldım.

Ax, nainsaf Hacı!!!

*Lağlağı*

---

## NƏ BORCU

Müsəlman qardaşlara məlum olsun ki, Peterburqda bir para rus misyonerləri, paytaxtda müsəlman məscidini gözləri götürmədiyindən hökumətə etiraz ediblər ki, müsəlmanlara mane olsun.

Bunu eşidibən cəmi müsəlman qəzetçilərimiz əllərinə qələm alıb başlayıblar misyonerləri pisləməyə və onlardan şikayətlər yazmağa. Hətta rus keşişlərindən məşhur hürriyyətpərəst Petrov da müsəlmanlara tərəf çıxıb, «Russki slovo» qəzetəsində misyonerlərə yerli-yataqlı və mənalı cavab yazıb: Biz lazım bilirik xəbər verək ki, yer üzünün müsəlmanları öz hüquqlarını mühafizət etməyə məhz biz iki nəfəri vəkil seçib və bizim ikimizdən savayı Peterburq misyonerlərinə heç kəsin haqqı yox idi cavab versin.

Hələ biz bunu bilmirik ki, biz burada dura-dura xalqa nə borcdur ki, müsəlmanlara zülm edirlər. Hər kəs gərək öz təklifini bilə.

İmza: Yer üzünün müsəlmanlarının vəkili Gəncədə Molla Məsum və Ordubadda Şeyx Mürtəza.

Molla Nəsrəddindən xahiş edirik ki, bu elanımızı çap eləsin.

---

## QƏZETLƏRDƏN

«İqdam», nömrə 5531.

«Səd həzaran təəssüf ki, Buxara əmiri həzrətləri səyahətlər icra edərək aləmi-mədəniyyətin səyi və qeyrəti nə kimi bir mərtəbəyə vasil olduğunu rəyül-eyn gördüyü halda, heç bir əqli-səlimin qəbul edəmiyəcəyi uşaq oynatmaq rəzalətlərindən təbəəsini təxzirə təşəbbüs eləməyir».

**Molla Nəsrəddin:**

Bunun səbəbi var. Səbəbi budur ki, əvvəl qabaqca əmir həzrətləri mütrübbazlığı özü gərək pis bilə ki, özgələrdə də görəndə buna mane ola. Rəhmətliyin oğlu «İqdam» da deyəsən dünyaya dünən gəlib və əmir həzrətlərini tanımır.

------

**«Siratül-müstəqim», nömrə 75**

Müctəhid olmaq üçün şəraiti biz üç şeydə həsr edə biliriz: 1) Lüğəti-ərəbiyyə, 2) Qurani-kərim və İslamın tarixi, 3) Səfayi-nəfs, ixlasi-qəlb, təharəti-xülq, istedadi-fitrət. Əgər bu üç şeyi əhatə edə biləcək bir nəslin yetişməsindən məyus olacaq olursaq, milləti-islamiyyəmizə məmat ilə hökm etmiş oluruq.

*Əlməğribi*

**Molla Nəsrəddin:**

Allah atana rəhmət eləsin. Yaxşıdır ki, bizi xəbərdar elədin, yoxsa «milləti-islamiyyəmizə məmat ilə hökm etmiş olacaqdıq».

## ELAN

Aşqabadda keçən il aşura günü ələmdar rolunu oynayan artist məşhur qarmonçalan Hilal babanın oğluna, haman günkü rolunu qurtarandan sonra Əliyevin mağazasını yarmağına görə bir il dustaq kəsilib. İndi isə yenə onun rolunu oynamağa bir halalzadə artist lazımdır ki, ibadətimizə nöqsan olmasın. Xahiş edənlər bu adresə rücu etsinlər:

*Aşqabadda ələmdar başçısı aşpaz Qurban.*

***

Aşqabad qazisinin yerinə Qarabağdan Ağa Bağır ağa təyin olundu. Qarabağlı qardaşlarımızdan Allah razı olsun.

## PARLAMENT NİTQİ

Məhərrəmin yeddinci günü Əncümən vəkili Mirzə Hüseyn cənabları belə buyurmuşlar:

– Camaat, mənəm o Mirzə Hüseyn ki, millət yolunda tamam mal-mülkümdən keçib və hətta canımdan da müzayiqə eləmədim, yəni istibdad zamanında xaraba məscid bucağında neçə nəfər kor-keçəl uşaq yığıb başıma, təməssük yazıb axşama kimi yarım batman çörək pulu qazanardım və bunu da tapmayanda acından köpük qusardım. Amma sonra var-yoxumu bu yolda qoyub əvvəl-axır bir neçə dükan aldım və Eynüddövlə Təbrizi mühasirə eləyəndə hamı şəhər əhli çörək tapmır desə də mən gecələr yavan cücəplov yeyib canımı tələf edib məşrutə aldım. Amma indi bir para bidin, firəngiməab, Allahdan qorxmayan adamlar öz nahaq işlərini yeritməkdən ötrü





Rotter





Rotter

Əncümənin qərardadına görə Təbri... bir alafranq baş qalmadı ki, qırxılmamış olsun.

deyirlər ki, mərsiyəxan gərək mərsiyə oxusun və politika işinə qarışmasın. Bu laməzhəblər deyirlər ki, Əncümən vəkili olan gərək farsi bilsin və heç olmasa İranın coğrafiyasını və qacariyyənin tarixini bilsin və genə də deyirlər ki, adam Dəxil və Qümri kitabını oxumaqlan siyasəti bilməz və halonki mən heç Dəxil də oxumamışam. Yalnız Qümridən yeddi kralın politikasını öyrənmişəm. Pəs, lazımdı hər yerdə başı tüklü, yaxası kravatlı adam görsələr, kravatın açıb, aparıb Hacı Rəcəbəlinin dəllək dükanında başını qırxdırsın və savabı çoxdur. Belə ki, icrayi-şəriətdən ötrü mən bu gündən bu ülgüc və bülövü də yanımda qoymuşam ki, düşəndə baş da qırxım. Əlbəttə, nə zərəri var ki, insan hər sənətdə mahir ola, əgər millət həmişə bu cahillikdə qaldı, ölənə kimi millətin vəkiliyəm. Əgər, Allah eləməsin, millət ayıldı, mənim yerimə bir anlayan adam qoydu, onda olmasın mərsiyəxanlıq. Əgər mərsiyəxanlıq da olmadı daha dəlləkliyə heç bir kəsin sözü yoxdur.

Bu cənab bu sözləri irad buyurandan sora dəlləklərin bazarı çox rəvac olduğuna bələdiyyə tərəfindən dəllələrin maliyyatını tümənə iki qran artırdılar.

**Molla Nəsrəddin:**

Hərçənd bir para nadinclər and içib rəvayət edirlər ki, Təbrizdə iğtişaş zamanı Mirzə Hüseyn fürsəti qənimət bilib əlinə çoxlu pullar keçirmişdi və hətta bu pulları da vermişdi bir ingilis cavanı saxlayırdı. Amma belə sözlərə biz inana bilmərik və təvəqqe edirik ki, dəxi bundan sora Mirzə Hüseyn barəsində bizə belə-belə böhtanlar yazmasınlar. Doğrudur, Mirzə Hüseynin bir nəfər ingilis cavanında saxlıda bir qədər pulu var, yəni təqribən bir neçə min tüməndir, amma bu pulların hamısı oğurluq və qarət pulu deyil. Xeyr, xeyr, kişi gərək insafnan danışa, bu pulların çoxunu Mirzə Hüseyn rüşvət babətindən ondan-bundan alıb. Çünki Əncümən tərəfindən möhürlənən kağızların heç birini Mirzə Hüseyn pulsuz möhürləməyib.

Qərəz, insan gərək haqqı itirməsin

---

## TƏŞƏKKÜR

«Şükri-nemət nemətət əfzun konəd, küfri-nemət əz kəfət birun konəd.»

(«Həqiqət», nömrə 29.)

Əhvalat belədir ki, Bakıda doktor Vartapetov cəmi ruhanilərə və o cümlədən mollalara bimizd müalicə edir və bunun əvəzində Bakı mollaları Vartapetovdan razılıq edirlər.

Buna sözümüz yoxdur. Həkimin də əməli gözəldir. Mollaların da rəftarı öz yerində.

Amma bizim fikrimizə bir şey gəlir.

---

Həkimlər xəstədən pul almayanda həmişə onun kasıblığını nəzərdə tuturlar və belə də gərək olsun. Xəstənin pulu olmasa, həkimə verə bilməz, həkim də pulsuz müalicə eləməsə, xəstə müalicəsiz can verər.

Heyf ki, biz bilmirik ki, aya cənab Vartapetov biçiz kasıblara da pulsuz müalicə edir, ya yox. Söz buradadır ki, bu barədə qəzetlərdə bir söz eşitməmişik. Əgər edirsə biz də öz tərəfimizdən doktor Vartapetovdan nəhayət razıyıq. Yoxsa əgər cənab Vartapetovun nə qapısında bir belə elan var, nə qəzetlərdə bunu camaata xəbər verib və nə kasıblardan buna şahid olan var, o vədə biz gərək yəqin edək ki, ruhanilərə haqsız müalicə etməkdə doktorun qəsdi ruhanilər vasitəsilə elə camaatı özünə razı etməkdir.

Quba meydanında və Qanlıtəpə məhəlləsində dava-dərmansız, həkimsiz və müalicəsiz hədsiz naxoşların varlığı ilə, İçəri şəhərdə dam-daş sahibi, məclislərdə yuxarı başda əyləşən və heç bir zəhmət çəkməyib həmişə camaatın çörəyinə şərik olan tox mollalara həqqülmüalicə etmək bir politikadır və Molla Nəsrəddin lüğətində politikanın mənası «biclik»dir.

---

Bir tərəfdən də doktor Vartepetova yazığım gəlir, çünki mollalar müalicəni müftə görüb, qəsdən o qədər naxoşlayacaqlar ki, daha yazıq həkim vaxt tapmayacaq ki, özgələrə də baxıb mənfəətbərdar olsun.

Canı cəhənnəmə, günah özündədir.

*Otaylı*

---

## TELEQRAF XƏBƏRLƏRİ

Ürgənc – Mədrəsə tələbələri məhərrəmin 25-də qəbristan ehsanında bir tikə plovdan ötrü zabastovka eləyib bir-birlərini çoxlu döydülər; neçəsi kötəkdən ölüm halətindədir. Xivə darülfünununda həkimlik kursunu qurtaran həkimlərdən ötrü adam göndərdilər.

---

Bakı – Məşhur artistka Komissarjevskayanın vəfatını eşidən kimi müsəlmanlar istədilər ağlasınlar, amma birdən yadlarına düşdü ki, bu nainsafın qızı nainsaf üzüaçıq gəzərmiş. Bunu bilən kimi dəxi müsəlmanlar ağlamadılar.

---

Ürgənc – Buxara hadisəsini eşidən kimi Baba Çətgərin fitnə və fəsad bazarı nəhayət rəvac tapmışdı. Lakin neçə gündür ovqatı zəhrimara dönüb oxları daşa dəydi. Səbəbi bu idi ki, Buxarada kafər ruslar müsəlmanı barışdırdılar. Ağacan Pazaçunun mətləbi ürəyində qaldı.

---

## ŞEYX MƏHƏMMƏD

(Lənətüllah əla qövməzzalimin)

Necə, «Saadi» bir yerdə deyibdir ki, yesli odin tsar, yəni padşah bir bağdan bir yabloka zornan alıb yesə, yəni bir alma, toqda, o vədə onun usluqaları bağın derevyalarını sovsem kökündən rabatay eləyib çıxardarlar.

Bu bir «primer»dir ki, təmsil üçün məsəl gətirdik ki, məsələn Təbriz şəhərində, necə ki, uşaqlıqda birimiz

çıxardıq bir daşın üstə və daşa deyərdik ki, «Ay daş yeri», o vədə o biri yoldaşımız daşın üstə çıxan uşağa deyərdi:

Eşşəkqulaq, qabanbaş, heç görmüsən yeriyə daş?

Yəni bu sözləri Təbriz dilinə tərcümə edəndə mənası bu olur ki:

Yastıqulaq qırxıqbaş, heç görmüsən ki, Mirzə Hüseyn kimi vaiz Əncümən üzvü ola? Yəni görmüsən ki, Seyid Mühəqqiq kimi baqqal Əncümən rəisi ola?

Bəli, keçək mətləbə.

Polojim ki, sən vaizsən, iki osyolun arpasını razdelit eləməyi bilməyə-bilməyə sən məhkəmədə sübuta yetirdin ki, Seyid Hüseyn gərək qətlə yetişə, potomu çto arvadların azadlığı yolunda məqalə yazıb.

Söz yox ki, əgər zibaği-rəiyyət məlik iskuşayet sibi o vədə Hakimabad məhəlləsində də Şeyx Məhəmməd kimi, ayıb olmasın (İbrahim bəy demiş), axundlar da deyəcəklər ki, gərək bəhayi tayfasının uşaqlarını öldürmək, necə ki, bir qədər vaxt bundan müqəddəm haman Şeyx Məhəmməd bir bəhayinin övrətini ərindən zornan alandan sonra hələ hökm də eləyib ki, övrətin təzə doğduğu uşağı boğsunlar.

Eşşəkqulaq, qabanbaş, heç görmüsən ki, günahsız uşağı öldürələr? Heç İspaniyada katolik «axundları»nın inkivizis zamanında belə vəhşiliklərə qol qoyardılar?

Şeyx Məhəmməd Təbrizi, pəh, pəh, pəh! Seyid Məhəmməd Şirvani, pəh, pəh, pəh! Adınız sizə qənim olsun, başınıza kül. Sizi görüm şirvanlı Hacı Əbdürrəhim əfəndi, Hacı Molla Abdullazadənin xeyir-duasından məhrum olasınız. Bari pərvərdigara, sən bunların heç birinə axirətdə huri və qılmanların dırnağını da vermə.

Ax, proklyatıy çeloveklər!

*«Dəli»*

---

## AŞQABADDA AŞURA GÜNÜ

Hamamçı Əzim dayı ülgücünü itiləyib aşura günü arvadların qucağındakı uşaqların başını çərtdi.

---

Bu il aşura günü qarabağlılar dəstələr tutmaqda xarici millətlər içində nəhayət şöhrətləndilər.

---

Qubalılar şalvarlarını da çıxarıb ağtuman, ağköynək olub küçədə tullana-tullana baş vurdular. Allah əcr versin.

---

Şirvanlılar şəbih çıxardıb, füqəranı soyub, Hacı Molla Əbdüləli kimi rövzəpəzə min beş yüz manat verdilər. Qurdlar da türkmənlərdən, ya əfğanlardan oğurladıqları qoyunları Qasim otağının altında qurban kəsdilər. Allah qəbul eləsin.

---

İranlılar: Bunlara da hürriyyət verilib, hər nə eləsələr azaddırlar. At bəzəyib, üstünə bir neçə göyərçin tutub bağladılar; tütək çalıb dünbək vurdular; Qara Səmədin oğlunun atını ziyarət elədilər; başlarını çapdılar. Hərə bir əba bürünüb dilsuz oxuyurdu. Bəzisi ərəb oldu, xalqın başına saman səpdi. Molla Xoruzulla müridlərini başına yığıb ayaqyalın zəncir vururdu, özü də Kürdşahnaz üstündə «Ərrəhman» oxuyurdu.

---

Məməqanlılar: Cibkəsənləri imam Zeynalabdin şəbihi edib dəvəyə mindirmişdilər.

---

Xivəlilər: Sünnü, şiə barışmağa görə əllərinə qara şam alıb, dəstə ilə məscidlərə gəlib başladılar oxumağa:
– Gəlmişik ey dostlar, şami-qəribanə biz.

---

Farslar: Bunlar da onlar kimi. İbrahim bəy nə gözəl deyib: Moşt nəmunəyi-xəlvar əst*. Gimnazistlərimiz zəncir vuranda dəxi farslara nə deyək?!

Əgər həqiqəti-islam dərcahan in əst
Həzar xəndeyi-küfürəst bərmüsəlmani.

*İmza: Qırxayaq*

---

## ÖLÜLƏR

Keçən gün cümə olduğuna görə ölülərin ruhları azad idi, Təbrizin tamam qəbristanlarının ölüləri şuriş edib məqbərə məscidinə dolmuşdular. Bunların şikayəti budur ki, guya intixabda bunların hüququ batıbdır, ondan ötrü ki, Əncümində mərsiyəxanların, mübaşirlərin, pişnamazların, sinəzən deyənlərin vəkili var, amma ölülər tərəfindən heç bir nəfər də vəkil yoxdu. Əvvəl ölüləri sakit eləməkdən ötrü Əncümən tərəfindən elan olundu ki, camaat yığılsın haman Məqbərə məscidində və ölülər tərəfindən Seyid İbrahim mücaviri və Molla Qasım cənablarını əksəriyyəti-təmamilən Əncümənə qəbul elədilər ki, rəqaib halvasının yağlı və şirin olmağı xüsusunda müzakirə olanda bu məzlumların hüququnu hifz eləsin. Elə ki, şənbə gecəsi olub ölülərin azadlığı vaxtı qurtardı, on yeddi nəfər ağsaqqal üç poçtada balon ilə göy tərəfinə heyət göndərilib və gələn cümədən ölülərin ruhlarının buraxılmasını xahiş ediblər. Bu heyət qayıdandan sora cavab nə olsa, yenə də xəbər verəcəyəm.

*Tambrançı*

---

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***

---

* Bir ovuc xalvarın nümunəsidir. *(Red. – T.K.)*




Зангезурскiй бекъ изъ своей деревни «Лиджъ» обратно къ себе домой.

**Zəngəzur mahalında bir bəy gedib özünəməxsus olan Lic kəndinə və orada bir neçə gün qalandan sora qayıdıb öz kəndinə gəlir.**

**(Balam, bu tüfəngi də sən götür, qatırın yükü ağırdır.)**